QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Sentyabr 2015 06 (1070)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## General Səməd bəy Mehmandarovun 160 illik yubileyinin keçirilməsi haqqında

## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2015-ci ildə görkəmli hərbi xadim, Azərbaycan Xalq Cümhuriyyətinin hərbi naziri, general Səməd bəy Sadiq bəy oğlu Mehmandarovun anadan olmasının 160 illiyi tamam olur.

General Səməd bəy Mehmandarov döyüş meydanlarındakı yüksək peşəkarlığı və zabit şərəfinə hədsiz sədaqəti ilə Azərbaycan xalqının hərb salnaməsinə unudulmaz səhifələr yazmışdır. Azərbaycan Xalq Cümhuriyyəti yaradılarkən ordu quruculuğu prosesinin bütünlüklə milli zəmin üzərində həyata keçirilməsi, hərbi potensialın məharətlə istiqamətləndirilməsi və konkret tarixi şəraitdə ölkənin ərazi bütövlüyünün, hərbi təhlükəsizliyinin layiqincə təşkil edilməsi məhz onun fəaliyyətinin nəticələridir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və gənc nəslin azərbaycançılıq məfkurəsinə uyğun, Vətənə məhəbbət ruhunda tərbiyəsində əhəmiyyətini nəzərə alaraq, Azərbaycan xalqı qarşısında müstəsna xidmətlər göstərmiş general Səməd bəy Mehmandarovun 160 illik yubileyinin dövlət səviyyəsində keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1.Azərbaycan Respublikasının Müdafiə Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi ilə birlikdə görkəmli hərbi xadim, general Səməd bəy Mehmandarovun 160 illik yubileyinə dair tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 29 sentyabr 2015-ci il*

## ADPU-da 15 sentyabr - Bilik Gününə həsr edilmiş tədbir keçirilib

Sentyabr ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bilik Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilmişdir.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov universitetin professor-müəllim heyətini və tələbə kollektivini, xüsusilə də, bu il universitetə qəbul olmuş I kurs tələbələrini yeni-2015-2016-cı tədris ilinin başlanması münasibətilə təbrik etmiş, onlara möhkəm cansağlığı və uğurlar arzulamışdır. Rektor Y.Məmmədov həmçinin yeni tədris ilində övladları ADPU-ya qəbul olmuş valideynləri də təbrik etmiş, onlara övladlarının daha böyük uğurlarını görməyi arzulamışdır.

Rektor Y.Məmmədov çıxışında bildirmişdir ki, xalqımızın böyük oğlu, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin strateji inkişaf konsepsiyasını çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev elm və təhsilə böyük qayğı və diqqət göstərir. Dövlət başçısı cənab İlham Əliyevin elm və təhsili ölkəmizin davamlı inkişaf strategiyasının əsas istiqamətlərindən biri elan etməsi bu sahəni yüksək inkişaf yoluna çıxarmışdır. İqtisadi cəhətdən sürətlə inkişaf edən, siyasi cəhətdən sabit, bütün dünyada siyasi nüfuzu durmadan yüksələn, müntəzəm olaraq mötəbər beynəlxalq tədbirlərin keçirildiyi dünyəvi, tolerant Azərbaycanda təhsilin inkişafı ölkəmizin ümumi inkişaf strategiyasının tərkib hissəsinə çevrilmişdir. Həyata keçirilən uğurlu sosial-iqtisadi siyasət nəticəsində ölkəmizin iqtisadi imkanları ilbəil sürətlə artır və bu sürətli, dinamik iqtisadi inkişafa uyğun olaraq elm və təhsilə göstərilən qayğı və diqqət də yüksəlir.

Azərbaycanda təhsil sahəsində bir çox layihələrin uğurla həyata keçirilməsində ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının (YAP) Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva böyük və əvəzsiz xidmətlər göstərir. Respublikamızda və eləcə də bir çox xarici ölkələrdə müxtəlif sosial-iqtisadi, humanitar layihələrin həyata keçirilməsinin birbaşa təşəbbüskarı və təşkilatçısı olan Mehriban xanım Əliyevanın fəaliyyətinin əsas istiqamətlərindən birini də məhz təhsilə qayğı və diqqət təşkil edir və onun bu sahədəki ardıcıl fəaliyyəti xalqımız tərəfindən çox yüksək qiymətləndirilir. Heydər Əliyev Fondunun "Uşaq evləri və internat məktəblərinin inkişafı", "Yeniləşən Azərbaycana yeni məktəb", "Təhsilə dəstək", "Məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramı" və digər layihələri özünün humanist məqsədləri ilə diqqəti cəlb edir. Yeri gəlmişkən, son 2 ildə ölkə təhsilində akademik göstəricilər yaxşılaşıb.




Yaxın gələcəkdə həyata keçirilməsi nəzərdə tutulan beynəlxalq layihələr çərçivəsində ali təhsil müəssisələrinin innovasiya mühiti daha da genişlənəcəkdir.

Rektor Y.Məmmədov qeyd edib ki, yeni tədris ilinin başlanması ADPU-nun professor-müəllim heyətinin və tələbə kollektivinin həyatında xoş və əlamətdar bir hadisədir. 2015-2016-cı tədris ili respublikamızın qabaqcıl ali təhsil müəssisələrindən biri olan ADPU-nun kollektivi üçün də bir sıra yeniliklərlə başlayıb. Belə ki, bu il ADPU-ya 10 fakültə, 21 ixtisas üzrə 1949 nəfər, rus bölməsində isə 10 ixtisas üzrə 109 nəfər qəbul edilib. Bütövlükdə builki tədris ilində ADPU-ya 2058 nəfər bakalavr qəbul edilib. Eyni zamanda bu il ADPU-ya ali təhsilin magistratura pilləsinə 20 ixtisas üzrə 290 nəfər magistrant qəbul edilib.



Yeni tədris ilində ADPU-ya ali təhsilin bakalavriat pilləsində dövlət sifarişi əsasında 1327 nəfər qəbul edilib. Cari tədris ilində ADPU-nun magistraturasına isə dövlət sifarişi əsasında 134 nəfər magistrant daxil olmuşdur. Həmçinin Təhsil Nazirliyinin həyata keçirdiyi "Sabah" qrupları layihəsinə uyğun olaraq yeni tədris ilində ADPU-da "İbtidai sinif müəllimliyi" ixtisası üzrə 15 nəfərdən ibarət qrup təşkil edilib

Qeyd edək ki, son illər ADPU-da təhsilin keyfiyyətinin yüksəldilməsi, tədris prosesinin təşkili və idarə olunması işinin müasir tələblər səviyyəsində qurulması, obyektiv və şəffaf təhsil mühitinin yaradılması üçün müntəzəm olaraq ardıcıl tədbirlər həyata keçirilir. Bu tədbirlərə informasiya-kom-mu-ni-ka-si-ya texnologiyalarının (İKT) vasi--təsi ilə kollokvium, semestr və dövlət imtahanlarının elektron-test üsulu ilə keçirilməsi, auditoriya və la-bo-ratoriyaların kompüter texnikası ilə təmin edilməsi, ixtisas fənlərinin tədrisinin səviyyəsinin yüksəldilməsi, tədris prosesinin yeni formalarının tətbiqi və s. daxildir. Bu yaxınlarda Təhsil Nazirliyinin dəstəyi ilə ADPU-nun Fizika, Kimya və Biologiya fakültələrində Almaniya istehsalı olan müasir avadanlığın quraşdırılması da universitetdə tədrisin kefiyyətinə səmərəli təsir göstərəcəkdir.

Son illər ADPU-nun beynəlxalq əlaqələri xeyli genişlənmiş və keyfiyyətcə yeni mərhələyə daxil olmuşdur. Belə ki, ADPU bu gün Türkiyənin Hacəttəpə Universiteti, Ankara Universiteti, Mehmet Akif Ersoy Universiteti, Qazi Universiteti, Muğla Sıtkı Koçman Universiteti, Balıkesir Universiteti, Şimali Kipr Türk Cümhuriyyətinin Yaxın Doğu Universiteti, Rumıniyanın, eləcə də Avropanın çox nüfuzlu Babeş-Bolyai Universiteti, Fransanın Strasburq Universiteti, Dağıstan Dövlət Pedaqoji Universiteti, Qazaxıstanın Abay adına Milli Pedaqoji Universiteti, Tacikistanın Kulyab Universiteti, Tatarıstan Dövlət Humanitar Universiteti, habelə Rusiyanın digər qabaqcıl universitetləri və Baltikyanı ölkələrin bir sıra tanınmış universitetləri ilə elm və təhsil sahəsində səmərəli əməkdaşlıq edir. Bütövlükdə isə ADPU son illər 10 ölkənin 22 universiteti ilə əməkdaşlıq haqqında müqavilə imzalamışdır. Bunlarla yanaşı, E-NOTES (European Computer Driving License National Operator and Test Centers in Azerbaijan) layihəsinə qoşulmaq üçün ADPU ilə Qafqaz Universiteti arasında mandat imzalanıb. Bu layihəyə əsasən universitetdə ECDL Milli Test Mərkəzi quraşdırılıb. Eyni zamanda ADPU-nun professor-müəllimləri dünyanın bir çox ölkələrində keçirilən yüksək səviyyəli beynəlxalq elmi konfranslarda, simpoziumlarda, konqreslərdə, həmçinin çoxsaylı layihə və proqramlarda fəal iştirak edirlər.

Yeni tədris ilinə hazırlıqla əlaqədar ADPU-nun maddi-texniki və tədris bazasının gücləndirilməsi və müasir informasiya-kommunikasiya texnologiyaları ilə təminatının daha da yaxşılaşdırılması üçün lazımi tədbirlər həyata keçirilmişdir və bu tədbirlərin gələcəkdə də davamlı olması nəzərdə tutulur.

**(Davamı 2-ci səhifədə)**

# ADPU-da 15 sentyabr - Bilik Gününə həsr edilmiş tədbir keçirilib

(Əvvəli 1-ci səhifədə)

Rektor Y.Məmmədov çıxışının bu məqamında deyib: “Əziz tələbə-gənclər, siz həyatınızın keyfiyyətcə yeni və daha məsuliyyətli bir dövrünə qədəm qoymusunuz. Ali məktəbə daxil olmaq sizin həyatınızda mühüm bir hadisədir. Ali təhsil bütövlükdə təhsil sisteminin ən mühüm, ən vacib pillələrindən biridir. Lakin siz ali məktəbə daxil olmağı son hədd hesab etməməlisiniz. Ali təhsil illərində siz öz bilik və bacarıqlarınızı, peşəkar qabiliyyətlərinizi artırmalı, mükəmməl bir mütəxəssis kimi yetişməlisiniz. Eyni zamanda siz müasir dövrün çağırışlarını yaxşı anlamalı və bu çağırışlara əsl vətəndaş mövqeyindən yanaşmalısınız. Siz ali təhsil aldığınız illərdə çox mütaliə etməli, daim öz üzərinizdə işləməli, elmi biliklərə dərindən yiyələnməli, intellekt səviyyənizi yüksəltməlisiniz.

Siz həyatda çox vacib və müqəddəs olan müəllimlik peşəsini seçmisiniz. Müəllimlik müqəddəs və şərəfli olmaqla yanaşı, həm də çox məsuliyyətli bir peşədir. Müəllim bütün həyatı boyu öyrətməklə bərabər, həm də özü daim oxuyub-öyrənən, mütaliə edən, öz üzərində çalışan, bilik dairəsini genişləndirən bir şəxsdir. Müəllimin şəxsiyyəti onun elmi biliyi, dünyagörüşü qədər gücə, təsirə malikdir. Buna görə də mən sizə sözün həqiqi mənasında yaxşı müəllim olmaq üçün bütün həyatınız boyu öz üzərinizdə işləməyi, bilik və peşəkarlıq səviyyənizi artırmağı, daxili mənəvi dünyanızı zənginləşdirməyi tövsiyə edirəm”.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, bu gün Azərbaycan cəmiyyətində müəllim peşəsi, onun cəmiyyətdə yeri, mövqeyi və eyni zamanda müəllim hazırlığı məsələləri ilə bağlı mühüm müzakirələr aparılır. Ulu öndərimiz Heydər Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verərək demişdir: “Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Bizim hər birimizi bu səviyyəyə çatdıran məktəbdir, məktəbdə dərs deyən isə müəllimdir. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram”.

Azərbaycan Prezidenti cənab İlham Əliyev də müəllim adına, müəllim əməyinə çox yüksək qiymət verir. Dövlət başçımız 2007-ci il sentyabr ayının 4-də “Ən yaxşı ümumtəhsil müəssisəsi” və “Ən yaxşı müəllim” müsabiqələrinin keçirilməsi haqqında sərəncamlar imzalamışdır. Ölkə Prezidenti cənab İlham Əliyev hər il “Ən yaxşı müəllim” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 100 nəfər müəllimin 5 min manat məbləğində, eləcə də “Ən yaxşı ümumtəhsil müəssisəsi” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 50 ümumtəhsil müəssisəsinin 10 min manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılmaları haqqında sərəncamlar imzalayır. Dövlət başçımızın bu sərəncamları cəmiyyətdə müəllim adının, müəllim nüfuzunun yüksəldilməsinə xidmət edir. Eyni zamanda təhsilin inkişafındakı xüsusi xidmətlərinə görə fərqlənən müəllimlər müxtəlif orden və medallarla təltif edilir, yüksək fəxri adlara layiq görülürlər.

Elm və təhsilin inkişafının dövlət siyasətinin əsas istiqamətlərindən biri elan edildiyi ölkəmizdə son illər yeni və müasir məktəb binalarının tikintisinə də böyük diqqət yetirilir. Dövlət başçımız Bakı şəhərində və eləcə də respublikamızın bölgələrində yeni istifadəyə verilən təhsil müəssisələrinin açılış mərasimlərində şəxsən iştirak edir, təhsilin keyfiyyətinin yüksəldilməsi üçün öz tapşırıq və tövsiyələrini verir. Bu da öz növbəsində ölkə rəhbərliyinin təhsilə göstərdiyi yüksək qayğı və diqqətin mühüm bir təzahürüdür.

Bütün bunlarla yanaşı, Təhsil Nazirliyi ötən tədris ilindən başlayaraq qəbul imtahanları zamanı 500 və 500-dən çox bal toplayan və ixtisas seçimi zamanı ilk olaraq müəllimlik ixtisasını seçən 300 abituriyentə təqaüddən əlavə 100 manat təqaüd verilməsi barədə qərar qəbul etmişdir. Təhsil Nazirliyi tərəfindən bu məqsədlə “Gələcəyin müəllimi təqaüdü” təsis edilmişdir. Bütün bunlar təbii ki, ölkəmizdə müəllim hazırlığına və pedaqoji fəaliyyətin stimullaşdırılmasına göstərilən xüsusi diqqət kimi qiymətləndirilir.

Rektor Y.Məmmədov çıxışının sonunda bir daha tələbə-gənclərə çox mütaliə etməyi, elmi biliklərə dərindən yiyələnməyi, öz bilik və bacarıqlarını, peşəkar qabiliyyətlərini artırmağı, yüksəkixtisaslı mütəxəssis və əsl vətəndaş kimi yetişməyi tövsiyə etmişdir.

Tədbirdə çıxış edən Səbail Rayon İcra Hakimiyyəti başçısının müavini Eldar Ağayev, Pedaqogika və psixologiya fakültəsinin dekanı, dosent Şəhla Əliyeva, həmin fakültənin Məktəbəqədər pedaqogika kafedrasının müdiri, professor Müseyib İlyasov, valideyn Ramiz Edirov, həmçinin Tarix fakültəsinin II kurs tələbəsi Şəlalə Qurbanova müəllim və tələbələri yeni tədris ilinin başlanması münasibətilə təbrik etmiş, onlara həyatda və təhsildə uğurlar arzulamışlar.

**Mənsur İBRAHİMLİ,**
**Könül NƏZƏROVA**

# ADPU-da görüş keçirilib



Sentyabr ayının 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyə Respublikasının Kahramanmaraş Sütçü İmam Universitetinin ölkəmizə səfərə gələn nümayəndə heyəti ilə görüş keçirilib. Görüşdə ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev, Kahramanmaraş Sütçü İmam Universitetinin Pedaqoji fakültəsinin dekanı, professor-doktor Niyazı Can, Gözəl sənətlər fakültəsinin dekanı, professor-doktor Mehmet Özkarcı, “Zəngin Azərbaycan Uğrunda” İctimai Birliyinin sədri, dosent İradə Əliyeva, sədr müavini Samir Orucov və Kahramanmaraş-Azərbaycan Mədəniyyət və Həmrəylik Birliyinin sədri Tural Şahbazlı iştirak ediblər.

Səmimi və səmərəli keçən görüşdə ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev universitetin yaranma tarixi, bugünkü fəaliyyəti, xarici əlaqələri və tədris prosesi haqqında qonaqlara ətraflı məlumat verib. Eyni zamanda Kahramanmaraş Sütçü İmam Universiteti və ADPU arasında Mövlana Mübadilə proqramı çərçivəsində əməkdaşlıq müqaviləsi imzalamaq niyyətləri və əməkdaşlığın daha da genişləndirilməsi müzakirə olunub.

**“Gənc müəllim”**

# ADPU-da 21 sentyabr - Beynəlxalq Sülh Gününə həsr edilmiş konfrans keçirilib

Sentyabr ayının 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında 21 sentyabr-Beynəlxalq Sülh Gününə həsr edilmiş konfrans keçirilib. ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev I kursa qəbul olmuş tələbə-gəncləri salamlayaraq onları tələbə adını qazanmaları münasibətilə təbrik edib, həyatda və təhsildə uğurlar arzulayıb. Professor F.Rzayev təhsillə, tədrislə yanaşı, belə maarifləndirici tədbirlərin də tələbə-gənclərin dünyagörüşünün formalaşmasına səmərəli təsir etdiyini vurğulayıb.

Konfransda tanınmış və təcrübəli hüquqşünas, ADPU-nun Fəlsəfə və sosial fənlər kafedrasının professoru, hüquq üzrə elmlər doktoru, Bakı Ağır Cinayətlər Məhkəməsinin hakimi, yazıçı-dramaturq, publisist Ənvər Seyidov məruzə ilə çıxış edib. Professor Ə.Seyidov bildirib ki, xalqımız 1991-ci ilin oktyabr ayın 18-də “Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı”nı qəbul etməklə yenidən öz dövlət müstəqilliyini bərpa edib və dünya birliyinə inteqrasiya etməyə başlayıb. Azərbaycan 1992-ci ilin mart ayında Birləşmiş Millətlər Təşkilatına (BMT) üzv qəbul edilib. Xüsusilə də, xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyev yenidən Azərbaycanda hakimiyyətə qayıtdıqdan sonra ardıcıl surətdə çoxsaylı siyasi, iqtisadi, sosial və hüquqi islahatlar həyata keçirilib, ölkəmiz hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu və vətəndaş cəmiyyətinin yaranması yolunda inamla adımlayıb, bir sıra beynəlxalq konvensiyalara qoşulub, milli qanunvericiliyin qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılması üçün səmərəli əməli tədbirlər həyata keçirilib. Ölkəmizdə insan və vətəndaş hüquq və azadlıqlarının yüksək səviyyədə təmin edilməsi üçün zəruri addımlar atılıb, bu sahədə mükəmməl qanunvericilik bazası yaradılıb. Azərbaycanda 1993-cü ildən müstəsna cəza növü sayılan ölüm cəzasının icrası üzərinə moratorium qoyulub, 1998-ci ildə isə ölüm cəzası ölkə qanunvericiliyindən çıxarılıb. Ölkəmiz 2001-ci ilin yanvar ayında Avropa Şurasına tamhüquqlu üzv seçilib. Hazırda ulu öndərimiz Heydər Əliyevin müdrik siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə həyatımızın bütün sahələrində islahatlar müasir dövrümüzün tələblərinə uyğun olaraq uğurla davam etdirilir. Azərbaycan hazırda hüquqi, demokratik, dünyəvi,




müasir, tolerant bir dövlətdir.

Professor Ə.Seyidov çıxışına davam edərək bildirib ki, hər il 21 sentyabr tarixi bütün dünyada Beynəlxalq Sülh Günü kimi qeyd edilir. Belə ki, BMT Baş Assambleyasının 30 noyabr 1981-ci il tarixli qərarı ilə Beynəlxalq Sülh Günü qeyd edilir. BMT-nin bu qərarının lehinə 192 ölkə səs vermişdir. 1982-ci ildən isə bütün dünya bu günü qeyd etməyə başlamışdır.

21 sentyabr-Beynəlxalq Sülh Günü Yer üzündə atəş və zorakılıqdan qlobal imtina günü kimi qəbul edilir. Onu da qeyd edək ki, 1954-cü ildə BMT-nin Nyu-Yorkdakı qərargahının həyətində Yaponiya tərəfindən bağışlanmış “Sülh zəngi” quraşdırılmışdır. Bu bayram məhz “Sülh zəngi”nin çalınması ilə başlayır. 21 sentyabr-Beynəlxalq Sülh Günü yalnız xalqlar arasında deyil, həm də ailədə, təhsil müəssisələrində, eləcə də bütün cəmiyyətdə zorakılığa qarşı birgə mübarizə aparılmasını nəzərdə tutan mühüm bir gündür.

21 sentyabr-Beynəlxalq Sülh Günü hər il Azərbaycanda da keçirilir. Ölkə Prezidenti İlham Əliyevin 27 dekabr 2011-ci il tarixli Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında insan hüquq və azadlıqlarının müdafiəsinin səmərəliliyini artırmaq sahəsində Milli Fəaliyyət Proqramı”nın 4.10-cu bəndində əhalinin hüquq və düşüncəsinin və hüquq mədəniyyətinin inkişaf etdirilməsi, ayrı-seçkiliyin yolverilməzliyi, sülh və dözümlülük mədəniyyətinin, eyni zamanda xalqımızın milli-mənəvi dəyərlərinin təbliği məqsədilə maarifləndirmə tədbirlərinin keçirilməsi təsbit olunmuşdur. Bununla yanaşı, ölkəmizdə hər il İnsan Hüquqları üzrə Müvəkkilin (Ombudsman) təşəbbüsü ilə 21 avqustdan-21 sentyabradək “Sülh aylığı” keçirilir. İrqindən, milliyyətindən, dilindən, dinindən və cinsindən asılı olmayaraq hamı dünyada sülhün, əmin-amanlığın qorunması üçün mübarizə aparmalıdır.



Professor Ə.Seyidov öz məruzəsində həm də bu gün bütün dünyada və eləcə də Azərbaycanda baş verən ictimai-siyasi prosesləri, xüsusilə də, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin səbəblərini və mahiyyətini ətraflı təhlil edib. Məruzəçi bildirib ki, Azərbaycanın 20 faizdən çox ərazisi təcavüzkar və terrorçu Ermənistan tərəfindən işğal edilib, 1 milyondan çox soydaşımız məcburi köçkün düşüb. Dünya birliyinin, beynəlxalq təşkilatların Ermənistan- Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin ədalətli həllinə ikili standartlardan yanaşmaları üzündən bu münaqişənin həlli ləngiyir. Lakin xalqımızın Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə öz ölkəsinin ərazi bütövlüyünü bərpa edəcəyi şübhəsizdir.

Professor Ə.Seyidov çıxışının sonunda tələbə-gənclərə ali təhsil illərində çoxlu mütaliə etməyi, elmi biliklərə dərindən yiyələnməyi, ölkəmizin ictimai-mədəni həyatında fəal iştirak etməyi və əsl vətəndaş kimi yetişməyi tövsiyə edib.



Konfransda ADPU-nun Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov və universitetin baş hüquqşunası Zakir Nağıyev də iştirak ediblər. Konfransda tələbə-gənclərin müxtəlif sualları cavablandırılıb.

**Könül NƏRİMANQIZI,**
**Gülnar BƏXTİYARQIZI**

# Dahiləşən, əbədiləşən, zirvələşən şəxsiyyət

## Dünyaya bir oğul göz açdı

Bütün ailələrdə olduğu kimi, zamanının əməksevər və müdrik insanı Əlirza kişinin ailəsində 1923-cü ilin may ayının 10-da sevincli bir hadisə baş verdi. Həmin gün onun ailəsində bir oğlan uşağı dünyaya göz açdı. Hamıdan çox sevinən Əlirza kişi dünyaya gəlmiş körpəyə Heydər adını verdi, Uca Tanrıdan ona uzun ömür, başı min bir bəlalar çəkmiş xalqına layiqli vətəndaş olmasını arzuladı. Zaman sürətlə keçdi, balaca Heydər məktəbə getdi, məktəbdə yaşıdlarından iti ağlı, dərin zəkası, yaşına yaraşmayan təmkini ilə seçildi. Müəllimlər həmişə onu başqalarına nümunə göstərdilər. Beləcə, kiçik Heydərin məktəb illəri bir göz qırpımında gəlib keçdi.Ürəyindəki arzuları onu Naxçıvan Pedaqoji Texnikumuna gətirdi. Müəllimlik peşəsinin sirlərinə yiyələnən gənc Heydəri memar olmaq, möhtəşəm binaların layihələrini hazırlamaq, doğma torpaqda əbədi iz qoymaq arzusu bir an da olsa rahat buraxmadı. Elə bu istəklə də, o 1939-cu ildə Azərbaycan Sənaye İnstitutunun(indiki Azərbaycan Dövlət Neft və Sənaye Universitetinə) memarlıq fakültəsinə daxil oldu. Lakin faşist Almaniyasının SSRİ-yə qəfil hücumu ona təhsilini başa çatdırmağa imkan vermədi.

*Heydər Əliyev 1941-ci ildə Naxçıvan Muxtar Sovet Sosialist Respublikasının Xalq Daxili İşlər Komissarlığında işə başladı. Əvvəlcə Naxçıvan MSSR-in Xalq Daxili İşlər Komissarlığında şöbə müdiri işlədi, 1944-cü ildə Naxçıvan Vilayət Komitəsi tərəfindən dövlət təhlükəsizlik orqanlarına işə göndərildi. 1950-ci ildən Azərbaycan SSR Nazirlər Soveti yanında dövlət təhlükəsizlik orqanlarında rəhbər vəzifələrdə işlədi. İşgüzarlığı, təşkilatçılığı, ətrafındakılara nümunə olması onun vəzifə pillərində irəliləməsinə səbəb oldu, 1964-cü ildən Azərbaycan SSR Nazirlər Soveti yanında Dövlət Təhlükəsizlik Komitəsində sədr müavini, 1967-ci ildən isə həmin komitənin sədri vəzifəsində müvəfəqiyyətlə çalışdı.*

Heydər Əliyev 1969-1982-ci illərdə Azərbaycan KP MK-nın birinci katibi və büro üzvü, 1982-ci ilin noyabrından 1987-ci ilə kimi SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini vəziyəsində işlədi.1971-ci ildən Sov. İKP MK üzvü, 1976-cı ildən Sov. İKP MK Siyasi Büro üzvlüyünə namizəd, 1982-ci ildən Sov. İKP MK Siyasi Büro üzvü oldu. SSRİ Ali Sovetinin 7-11-ci çağırışlarının deputatı olan Heydər Əliyev 1979 və 1983-cü illərdə Sosialist Əməyi Qəhrəmanı adına layiq görüldü.

Azərbaycan xalqının xöşbəxtliyi və gələcəyi uğrunda həmişə mübarizə aparan görkəmli dövlət xadimi, tarixə qurucu və xilaskar kimi daxil olmuş Heydər Əliyev Azərbaycan xalqının taleyində, onun mənəvi, siyasi və ictimai həyatında misilsiz xidmətlər göstərən dahi bir şəxsiyyətdir.

Heydər Əliyev Azərbaycan xalqının XX əsrdə yetirdiyi ən parlaq simalardan biri olub adını tarixin səhifəsinə qızıl hərflərlə yazdı. Ulu Öndər Azərbaycana rəhbərlik etdiyi illərdə Azərbaycanın tərəqqisinə və çiçəklənməsinə, beynəlxalq aləmdə tanınmasına, dövlətçiliyimizin möhkəmlənməsinə, xalqımızın milli-mənəvi dirçəlişinin qorunub saxlanmasına çalışdı və sözün həqiqi mənasında müstəqil Azərbaycan dövlətinin qurucusu kimi tarixə daxil oldu.

Heydər Əliyev Azərbaycana rəhbərlik etdiyi illərdə öz zəngin təcrübəsi, yüksək intellekti, milli mədəniyyətimizə dərindən bələd olması sayəsində milli dövlətçilik siyasəti işləyib hazırladı və bütün çətinliklərə sinə gərərək onu dönmədən həyata keçirdi.

Heydər Əliyevin həyat amalı, zaman və məkan anlayışına sığmayan siyasi fəaliyyətinin əsas məqsədi azad və müstəqil dövlət qurmaq idi. O, həyatının 35 ilini bu amal uğrunda mübarizəyə həsr etdi.

## Cəsarətli birinci katib

Heydər Əliyev Azərbaycan KP MK-nın 1969-cu il iyul plenumunda Azərbaycan KM MK-nın birinci katibi seçildi. Beləliklə, 70-ci illərin əvvəllərində Azərbaycanın iqtisadi, ictimai-siyasi və mədəni taixində yeni bir dövr başlandı. Heydər Əliyevin uzaqgörən siyasətinin nəticəsi olaraq ötən əsrin 70-85-ci illərində 213 yeni iri sənaye müəssisəsi istismara verildi. Həmin dövrdə Azərbaycanda hər gün 41 min ton neft, 37 milyon kubmetr qaz çıxarılır, 2.200 ton polad tökülür, 69 min metr boru, 4.900 avtomobil təkəri, 2.700 ton mineral kübrə, 968 məişət kondisioneri, 734 soyuducu istehsal olunur, 546 min metr parça toxunurdu.



Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi 70-ci illərdə Azərbaycan təhsili intibah dövrünü yaşadı. Həmin dövrdə məktəbəqədər tərbiyə, ümumtəhsil, texniki peşə və orta ixtisas məktəblərinin, ali təhsil müəssisələrinin şəbəkəsinin inkişaf etdirilməsi Heydər Əliyevin diqqət mərkəzində oldu. 1970-1982-ci illərdə Azərbaycanda 5 ali məktəb yaradıldı.

1970-1980-ci illərdə Heydər Əliyevin şəxsi təşəbbüsü ilə Azərbaycandan kənarda, keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərlərinin 170-dən çox ən məşhur ali məktəblərində respublikamızın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gəncin ali təhsil almasına, yüksəkixtisaslı mütəxəssis kimi yetişməsinə imkan və şərait yaradıldı.

Heydər Əliyevin milli-ideoloji konsepsiya yaratması o zamankı SSRİ-nin rəhbər partiya işçilərinin nəzərindən qaçmırdı. Ona qısqanclıqla yanaşalar da olurdu. Ancaq Ulu Öndər bunu elə ustalıqla edirdi ki, onlar böyük zəka sahibinin qarşısında etiraz etməyə, hansısa düzəlişlərin həyata keçirilməsinə cəsarət etmirdilər. Heydər Əliyev işini gözəl bildiyi, hadisələrin gedişini diqqətlə izlədiyi, düzgün nəticə çıxarmağı bacardığı üçün,Qazaxıstan Prezidenti Nursultan Nazarbayev təbirincə desək, «xalqı birləşdirməyə və onu tərəqqi, inkişaf yoluna istiqamətləndirməyə müvəffəq olmuşdur...».

70-ci illərdə Azərbaycanda sağlam millətçilik ideyalarının yayılmasında, xalqda milli mənlik şüurunun və milli qürur hissinin tərbiyə olunmasında Heydər Əliyevin xidmətləri misilsizdir.Ümummilli Lider sözün həqiq mənasında millətçi idi, ancaq bu millətçilik hissləri şovinizmdən çox-çox uzaq idi. Azərbaycan xalqının mənşəyi, formalaşması, millətin təşəkkülü kimi mühüm tarixşünaslıq məsələləri məhz ötən əsrin 70-ci illərində kəskinliyi ilə qoyuldu, müzakirələr keçirildi,yeni elmi konsepsiya yarandı. 60-cı illərin sonu, 70-ci illərin əvvəllərində Azərbaycan tarixinin problemlərinin yenidən işlənməsinə başlanıldı. Şimali Azərbaycanın Rusiya tərəfindən işğalı, 1918-ci il Mart soyqırımı, Azərbaycan Xalq Cümhuriyyətinin tarixinin öyrənilməsi, 10 cildlik Azərbaycan Sovet Ensiklopediyasının nəşr olunması Ümummilli Liderin apardığı düzgün milli siyasətin nəticələri hesab olunmalıdır.

Heydər Əliyev xalqımızın mənəvi irsi ilə daim fəxr edirdi. Onun titanik fəaliyyəti nəticəsində unudulmuş, yaddan çıxarılmağa məcbur edilmiş minlərlə soydaşımız sovet ideologiyasının məkrli məngənəsindən xilas oldu. Millətçi damğası vurulan N.Nərimanovun100 illik yubileyinin təntənə ilə qeyd edilməsi, Bakıda və Ulyanovskda əzəmətli heykəlinin qoyulması, Bakıda və Tibilisidə ev muzeylərinin açılması,böyük ədib Hüseyn Cavidin nəşinin Azərbaycana gətirilməsi, onun doğma Naxçıvanda dəfni, məqbərə inşa edilməsi, 416-cı diviziyanın qəhrəmanlığını əbədiləşdirmək üçün Taqanroq şəhərinin yaxınlığında əzəmətli memorial ucaldılması, Krımda həlak olmuş azərbaycanlıların şərəfinə Simferopolda Sapun dağında 77-ci atıcı diviziyanın şərəfinə xatirə kompleksi tikilməsi, bir əsrə yaxın zindanda qalmış Cənub mövzusunun gündəmə gətirilməsi Heydər Əliyevin Vətən sevgisinin zirvəsi idi.

## Kremldə

Heydər Əliyev 1982-ci ilin dekabrında Sov. İKP MK Siyasi Bürosunun üzvü seçildi, SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini təyin edildi. Heydər Əliyevin Kremldə keçmiş SSRİ-nin əsas rəhbərlərindən biri kimi yüksək vəzifə tutduğu dönəmlərdə ermənilər Azərbaycana qarşı hər hansı tələb səsləndirməyə cəsarət etmədilər. Sovet imperiyasına ermənipərəst M.Qorbaçov rəhbər seçildikdən sonra ermənilər fəallaşdılar. Ermənistanda və Dağlıq Qarabağdakı millətçi separatçı qüvvələr Moskvadakı himayədarlarına arxalanaraq haqsız iddiaları, DQMV-nin Ermənistanna birləşdirilməsi, bu əraziyə qeyri-qanuni olaraq müstəqillik verilməsi kimi hüquqazidd bəyanatlar səsləndirməyə başladılar. Təəssüflər olsun ki,Azərbaycanın o zamankı rəhbərləri siyasi iradə, milli təəssübkeşlik nümayiş etdirə bilmədilər. Heydər Əliyevin 1987-ci ildə M.Qorbaçovun yetirdiyi siyasətə etiraz edərək vəzifəsindən istefa verməsindən sonrakı 5 il Azərbaycan üçün faciələrlə dolu illərə çevrildi. Vəzifədən uzaqlaşmasına baxmayaraq Ulu Öndər bir an da olsa Azərbaycanı unutmadı, respublikada baş verən hadisələri diqqətlə izlədi. 1990-cı ilin 20 Yanvarında sovet qoşunlarının Bakıda törətdiyi qanlı faciə ilə əlaqədar yanvarın 21-də Azərbaycanın Moskvadakı nümayəndəliyinə gələrək bəyanatla çıxış edərək faciənin səbəbkarlarının müəyyənləşdirilməsinin və cəzalandırılmasının vacibliyini vurğuladı.

## Naxçıvan müdrik oğlunu alqışlayır

Ümummilli lider Heydər Əliyevin Naxçıvandakı fəaliyyəti alimlərimizin daimi tədqiqat mövzusu olmalıdır. Məhz 1990-1993-cü illərdə Heydər Əliyevin qətiyyəti nəticəsində muxtar respublikanın adından «sovet», «sosialist» sözləri çıxarıldı, Azərbaycan Xalq Cümhuriyyətinin üçrəngli bayrağı Naxçıvan Muxtar Respublikasının Dövlət bayrağı kimi qəbul olundu, 20 Yanvar faciəsinə siyasi qiymət verildi, Naxçıvan əhalisi SSRİ-nin saxlanılması barədə referendumda iştirakdan imtina etdi, 31 dekabr Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü kimi qəbul olundu. Başqa sözlə, Heydər Əliyev Azərbaycandan ərazicə ayrı düşmüş Naxçıvanı qoruyub saxladı. Bu tarixi nailiyyət hesab olunmalıdır.

## Qurtuluşa gedən yol

1991-ci ilin oktyabrında Azərbaycan müstəqillik əldə etdikdən sonra ölkədə daxili vəziyyət gərginləşdi və hakimiyyət böhranı yarandı. İctimai həyatın bütün sahələrində xaos, hərc-mərclik başladı. Orduda vəziyyət ağırlaşdı, fərarilik artdı. Erməni təcavüzü gündən-günə gücləndi. Azərbaycanda hakimiyyət boşluğu yarandı. Gənc respublikada rəhbərliyə yiyələnmək üçün ayrı-ayrı şəxslər və qruplar arasında mübarizə başladı. 1992-ci ilin may ayının 14-də hakimiyyəti ələ keçirən Xalq Cəbhəsi ilk gündən özünün qeyri-sağlam fəaliyyəti ilə ölkəni idarə edə bilməyəcəyini göstərdi.

Hadisələrin gedişi ziyalıları narahat edirdi. Ölkədə qurtuluş hərəkatı formalaşırdı. Bu hərəkatın təşəbbüskarları Heydər Əliyevin ətrafında toplaşmağa başlamışdılar. Nəhayət, vəziyyətin kəskinləşdiyini görən 91 nəfər Azərbaycan ziyalısı 1992-ci il oktyabrın 16-da «Səs» qəzeti vasitəsi ilə Heydər Əliyevə müraciət etdilər. Yeni Azərbaycan uğrunda mübarizə başladı. 1992-ci ilin noyabrın 21-də Naxçıvanda YAP-ın təsis edilməsi ilə siyasi təşkilatlanma prosesi sürətləndi.

İqtidarın səriştəsizliyi nəticəsində ölkə iqtisadi böhran məngənəsində boğulurdu. Hərc-mərclik, həqiqəti söyləyən ziyalıların təqib edilməsi, separatçı sövdələşmələr, sənaye, tikinti və mədəniyyət müəssisələrinin iflic vəziyyətinə düşməsi reallıq idi. Ən dəhşətlisi o idi ki, xalqla dövlət arasında uçurum getdikcə dərinləşir, dövlətə inam azalırdı.

1993-cü ilin iyun hadisələri Azərbaycan tarixinə yalnız növbəti hakimiyyət dəyişikliyi kimi düşmədi. Bu tarixi məqam əsasən xaosdan qurtuluşa, tənəzzüldən intibaha keçidin başlanğıc mərhələsini, parçalanmış dövlətin bütövlüyünün bərpa olunmasına zəmanətin verilməsini şərtləndirdi. O dövrdə hakimiyyətdə olan AXC-Müsavat cütlüyü dövləti xilas etmək əvəzinə cinayətkar birləşmələrin şərtlərini qəbul etməyə təklif edir, daxili qoşunlar Gəncə əhalisinə hücum üçün əmr gözləyirdi. Başqa sözlə, 4 iyun hadisələri milli dövlətçiliyimizin, xalqımızın sınaq günü idi.

Azərbaycanın o dövrdəki rəhbərləri münaqişənin həlli üçün əhəmiyyətli addım atmadılar. Əksinə, hakimiyyət uğrunda, kreslo uğrunda mübarizə kulminasiya nöqtəsinə çatdı. Hakimiyyət strukturlarındakı çaşqınlıq, bir-birini əvəz edən istefalar, əldən gedən torpaqlar, daxili çəkişmələr Dağlıq Qarabağı unutdurdu. Azərbaycan vətəndaş müharibəsi həddinə çatdı.1990-1993-cü illərdə Azərbaycan üç rəhbər gördü, üç rəhbərin qaçışının şahidi oldu. Nəhayət, xaosdan cana doymuş xalq yenə gözünü Naxçıvana dikdi, təkidlə Heydər Əliyevin Bakıya gəlməsini tələb etdi.

Bakıda Ulu Öndəri nə gözləyirdi? Xalq hesab edirdi ki, ancaq Heydər Əliyev respublikanı fəlakətlərdən, daxili və xarici antiazərbaycan qüvvələrin qəsdindən, vətəndaş müharibəsindən, nəhayət, müstəqilliyin məhvindən qoruya bilər. Ancaq hakimiyyət hərislərini Vətən, torpaq deyil, kreslo maraqlandırırdı.1994-cü ilin sentyabında görkəmli dövlət xadimləri Afiyədin Cəlilov və Şəmsi Rəhimov qətlə yetirildilər. 1994-cü ilin oktyabrında və 1995-ci ilin martında gizli qüvvələrin dəstəyi ilə Azərbaycanda hakimiyyəti ələ keçirmək üçün cəhd edildi. Heydər Əliyev hər iki cəhdin qarşısını aldı. Xalq Ulu Öndərin arxasında dayandı, onun televiziya ilə çağırışına səs verərək gecədən xeyli keçməsinə baxmayaraq, Prezident Aparatının qarşısına toplandı. Ümummilli Lider bir daha sübut etdi ki, ***xalqın dəstəyi omadan zor gücünə hakimiyyəti ələ keçirmək mümkün deyildir.***

Milli tariximizin ən ağrılı problemi olan Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ probleminin həlli Heydər Əliyevin diqqət mərkəzində olmuşdur. Qeyd edək ki, onun ATƏT-in 1996-cı il Lissabon görüşündəki cəsarətli addımı, münaqişənin həlli üçün irəli sürdüyü üç prinsip bu gün də Minsk Qrupu həmsədrlərinin fəaliyyətinin əsasını təşkil edir.

Heydər Əliyev Azəbaycanın müasir tarixinə müstəqil Azərbaycan Respublikasının Konstitusiyasının yaradıcısı kimi daxil oldu. Konstitusiyaya əsasən ölkədə demokratik, hüquqi, dünyəvi və unitar dövlət qurulması üçün 400-dək qanun qəbul edildi,parlament formalaşdırıldı, ölkəmizdə demokratik islahatlar keçirildi, hüquqi dövlət quruculuğu geniş vüsət aldı.

Milli düşüncə, milli oyanışın inkişafında milli dilin əvəzolunmaz vasitə olduğunu yaxşı bilən Heydər Əliyev ***Azərbaycan dilinin dövlət dili*** statusu almasını diqqət mərkəzində saxladı. Onun dövlət dilinin tətbiqi işini təkmilləşdirilmək, Azərbaycan Respublikası Dövlət Dil Komissiyasının yaradılması, Azərbaycan əlifbası və Azərbaycan dili gününün təsis edilməsi haqqında fərmanları və qəbul olunmuş qanunlar ölkəmizdə dil siyasətinin, dil quruculuğunun mükəmməl konsepsiyasını verən qanunverici aktlardır.

Heydər Əliyevin Azərbaycan rəhbərliyinə qayıdışı ilə ***müstəqillik, azərbaycançılıq, dövlətçilik, ədalətlilik, demokratiklik, milli tərəqqi və dünyəvilik*** kimi ümumbəşəri dəyərlər təşkil edən yeni bir ideologiyanın əsası qoyuldu.

(Davamı 4-cü səhifədə)

# Dahiləşən, əbədiləşən, zirvələşən şəxsiyyət

(Əvvəli 3-cü səhifədə)

Ümummilli Liderin ən çox diqqət yetirdiyi məqamlardan biri də azərbaycançılıq ideyasının gücləndirilməsi, dünya azərbaycanlılarının bu amal ətrafında birləşdirilməsi oldu. Tarixin amansız və sərt sınaqları dövründə dünyanın ayrı-ayrı ölkələrinə səpələnərək qürbətdə yaşamaq məcburiyyətində qalmış soydaşlarımızın taleyi Ümummilli Lideri bir an da olsa rahat buraxmadı. Onun Naxçıvan Ali Məclisinin Sədri olarkən 1991-ci ildə 31 Dekabrı Dünya Azəbaycanlılarının Həmrəyliyi Günü elan etməsi dünyanın 70 ölkəsində yaşayan 50 milyondan artıq azərbaycanlının ürəyində Vətən sevgisinin güclənməsinə təkan verdi. Bu birliyin siyasi əsaslarının yaradılması, təşkilatlanma prosesinin sürətlənməsi, 2001-ci ildən başlayaraq dünya azərbaycanlılarının qurultaylarının keçirilməsi dünya azərbaycanlılarının həyatında tarixi hadisəyə çevrildi. «Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam!» deyən Heydər Əliyev Azərbaycan dilinin, mədəniyyətinin, milli dəyərlərin, adər və ənənələrin qorunması və yaşaması üçün siyasi, iqtisadi və hüquqi baza yaradılmasını diqqət mərkəzində saxladı.Heydər Əliyevin hakimiyyətə yenidən qayıdışı Azərbaycanı vətəndaş müharibəsindən xilas etdi, yenicə qurulmuş kövrək addımlı müstəqil Azərbaycan Respublikası yaşamaq şansı qazandı.

## Ali Baş Komandan

Azərbaycan Ordusunun yenidən təşkili Ulu Öndərin adı ilə bağlıdır. Onun hakimiyyətə qayıdışı ilə siyasi sabitliyin bərpa olunmasının əsası qoyuldu. Hərb cəbhəsində atəşkəsə nail olundu. Hökumətə və hakimiyyətə tabe olmayan, dövlətçilik və müstəqillik, vətəndaşların təhlükəsizliyi üçün qorxu yaradan qanunsuz fəaliyyət göstərən silahlı dəstələr ləğv edildi. Az müddətdə Müdafiə Nazirliyinin tabeliyində və dövlətin nəzarətində olan ordu birləşmələri yaradıldı və düşmənin hücumlarının qarşısı alındı.Əlbəttə, Ümummilli Lider yaxşı başa düşürdü ki, ilk növbədə müharibə dayandırılmalıdır. Onun səyi nəticəsində 1994-cü il mayın 12-də atəşkəs haqqında Bişkek protokolu imzalandı, həmin ilin dekabrında keçirilən ATƏT-in Budapeşt sammiti Qarabağ münaqişəsinin beynəlxalq hüquq prinsiplərinə uyğun həlli haqqında qərar çıxardı.

## İqtisadi inkişafın «Heydər Əliyev modeli»

Heydər Əliyevin ən böyük xidmətlərindən biri, Azərbaycanın öz təbii sərvətlərinə sahib çıxması, ölkənin neft-qaz ixracatçısına çevrilməsidir. Bu yöndə həyata keçirilən ən böyük layihələrdən biri 1994-cü ilin sentyabrın 20-də Bakıda müxtəlif ölkələrin böyük neft şirkətləri ilə imzalanan «Əsrin müqaviləsi» dir. Bu müqavilə ilə neft strategiyasının əsası qoyuldu. Heydər Əliyevin neft strategiyası nəticəsində Azərbaycana investisiya qoyuluşu artdı. İnvestisiyalar Azərbaycanda iqtisadi sabitliyin bərqərar olunmasında böyük rol oynadı, iqtisadi islahatlar üçün baza yarandı, sosial islahatlar üçün iqtisadi potensial əldə edildi.Bakı-Tbilisi-Ceyhan neft ixrac boru kəməri layihəsi Heydər Əliyev uzaqgörənliyinin parlaq təzahürüdür. Bu layihə ilə Xəzərin karbohidrogen ehtiyatlarının dünya bazarına çıxarılmasına əngəl olan qüvvələrin əl-qolu bağlandı.Avroasiya nəqliyyat dəhlizi ilə «dəmir İpək yolu» na yaşıl işıq yandırıldı.

## Dahiləşən şəxsiyyət

Dünyanın ən məşhur siyasətçiləri, görkəmli dövlət xadimləri Heydər Əliyevi «siyasət nəhəngi», «siyasət şahmatının mahir ustası» adlandırmışlar. Onun tarixi perspektivləri qabaqcadan görməsi, ən çətin məqamlardan yeganə düzgün qərara qəbul etmək qabiliyyəti çoxlarını heyran qoymuşdur.

Almaniya parlamentinin üzvü V.Vimmer Heydər Əliyevin şəxsiyyətindən bəhs edərkən söyləmişdir ki, «İndi Azərbaycan İkinci Dünya müharibəsindən çıxmış Almaniyanı, Prezident Heydər Əliyev isə kansler Adenaueri xatırladır. Əgər daxili və xarici qüvvələr ona mane olmasalar, işləməyə imkan versələr Azərbaycanın indiki inkişaf mərhələsi onun tarixinə intibah dövrünün başlanğıcı kimi daxil olacaq».

Böyük Britaniyanın sabiq Baş naziri, "dəmir ledi" Marqaret Tetçer onu «müasir zəmanəmizin görkəmli siyasi xadimi», ABŞ-ın sabiq dövlət katibi Madlen Olbrayt «Corc Vaşinqtona bərabər şəxsiyyət» kimi xarakterizə etmişdir.

Böyük zəkası, ağlı, düşüncəsi və cəsarəti qarşısında baş əydiyini bildirən Türkiyənin dövlət naziri Namik Kamal Zeybək Heydər Əliyevi "Bütün Türk dünyasının lideri» adlandırmışdır. Rumıniyanın Prezidenti İon İliyeskinin təbirincə desək, «Heydər Əliyevin əzmi və qətiyyəti sayəsində Azərbaycanda insanların çəkdikləri əzabəziyyətə son qoyulmuşdur».

Heydər Əliyev hansı sahədə işləməsindən asılı olmayaraq, özünün iti ağlı, dəmir iradəsi, dərin zəkası, təmkini, fenomen yaddaşı, ən başlıcası isə ətrafındakılara təsir etmək bacarığı ilə seçilən şəxsiyyət olmuşdur.

Heydər Əliyev şəxsiyyət kimi tarixi hadisədir. O, həmişə lider olub. İmperiya dövründə də, müstəqillik illərində də liderliyi bir an da olsa unutmayıb, onu bolluca tərif ediblər, tənqid atəşinə də tutublar, lakin nə təriflər, nə də tənqidlər onu dəyişdirməyib, çünki onun amalı, əqidəşi və mənəviyyatı buna imkan verməyib. Özünün etiraf etdiyi kimi, ***O, yaradanına, xalqına, bir də zəhmətinə arxalanıb.***

Heydər Əliyev ömrünün 81-ci ilində, müdriklik, ağsaqqallıq zirvəsində xalqının çismən tərk etdi. Onun həyata keçirmək istədiyi böyük arzuları var idi, onları həyata keçirməyi oğluna, ləyaqətli varisinə həvalə etdi.

## Ləyaqətli varis. Böyük yolun davamı

Müstəqilliyə nail olmaq və onu qoruyub saxlamaq çox çətin və məsuliyyətli işdir. Xalqımız bunun acısını əsrin əvvəllərində dadmışdır. Bu gün Azərbaycan dövlətinin başında Ulu Öndərin siyasi kursunu davam etdirən cənab İham Əliyev dayanmışdır. Obrazlı desək, Azərbaycan dünya okeanına üzməyə çıxan yeni bir gəmidir. Okean isə fırtınalı və qasırğalıdır. Ancaq təcrübəli kapitan gəmini okeanda düzgün marşrutla irəli apara bilər. Heydər Əliyev «Müstəqil Azərbaycan» adlı gəmini dünya okeanına çıxardı, onun kurşunu müəyyənlədirdi. Bu kursu ancaq Ulu Öndərin məktəbini keçmiş bir şəxs davam etdirə bilər və xalqımız onu özünə rəhbər seçmişdir.

Cənab İlham Əliyevin məqsədyönlü fəaliyyətinin nəticəsidir ki, Azərbaycan bölgənin iqtisadi baxımdan ən sürətli və dinamik inkişaf edən ölkəsinə çevrilmişdir. İlham Əliyevin uğurla davam etdirdiyi «iqtisadiyyatın Heydər Əliyev modeli» öz bəhrəsini verməkdədir.2012-ci ilin fevral ayında Azərbaycanın «Azərspase-1» ilk süni telekommunikasiya peykinin orbitə buraxılması ölkəmizin ən böyük uğurlarından biridir.

Kənd təsərrüfatının ayrı-ayrı sahələrində sürətli inkişaf davam etməkdədir. Bir çox kənd təsərrüfatı məhsullarına olan ehtiyac daxili ehtiyatlar hesabına ödənilir.

Cənab İlham Əliyev həmişə regionların sosial-iqtisadi inkişafını diqqət mərkəzində saxlayır. Beləliklə, iqtisadi inkişafın yeni modeli - «Azərbaycan modeli» formalaşmışdır.

Müasir Azərbaycan bu gün sürətlə inkişaf edir. Bu inkişafa mane olan yeganə əngəl isə Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həll olunmamasıdır. Dövlət başçımız dəfələrlə qeyd etmişdir ki, münaqişə ancaq ölkəmizin ərazi bütövlüyü, süverenliyi əsasında həll olunmalı,yurd - yuvalarından didərgin salınmış soydaşlarımız yerlərinə qayıtmalı, ata-baba torpaqlarının sahibi olmalıdırlar. Buna görə də bu gün demokratiyadan dəm vuran Qərb dövlətləri ikili yanaşmaya son qoymalı, beynəlxalq hüquqa hörmət etməli, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsini beynəlxalq hüquq normaları çərçivəsində həllinə dəstək verməlidirlər.

Vaxtilə Turan hökmdarı Əfrsiyab türkü dəniz balıqqulağında inciyə bənzətmişdir. Zaman göstərdi ki, balıqqulağındakı inci Azərbaycandır. O artıq dünya meydanına çıxmışdır. İndi onun qiyməti gündən-günə artır və hamı onunla hesablaşır. Müstəqil Azərbaycanın qurucusu və memarı Heydər Əliyevdir. Zaman keçdikcə dahiləşən, əbədiləşən və zirvələrə yüksələn Ulu Öndərin söylədiyi ***«Azərbaycanın müstəqilliyi daimidir, əbədidir, dönməzdir»*** kəlamının həqiqət olduğu təsdiq olunur.

**Mais Əmrahov,**
**Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru, tarix üzrə elmlər doktoru**

# Təhsilimizin inkişafına yönəlmiş fərman, sərəncam və qərarlar

• Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev yeni dərs ili ərəfəsində bir sıra tədris müəssisələrində olub. Dövlətimizin başçısı sentyabrın 3-də Bakının Səbail rayonundakı 189-190 nömrəli orta məktəbdə, Yasamal rayonundakı Fizika, Riyaziyyat və İnformatika Təmayüllü liseydə, sentyabrın 7-də Binəqədi rayonundakı 283 nömrəli orta məktəbdə, sentyabrın 10-da Nəsimi rayonundakı Texniki-Humanitar Liseydə aparılan təmir və yenidənqurma işlərindən sonrakı vəziyyətlə tanış olub.

• Azərbaycan Respublikası Prezidentinin 3 sentyabr 2015-ci il tarixli sərəncamı ilə Azərbaycan Dövlət Neft Akademiyasının adı dəyişdirilərək Azərbaycan Dövlət Neft və Sənaye Universiteti adlandırılıb.

• Azərbaycan Respublikası Prezidentinin 24 iyul 2015-ci il tarixli fərmanı ilə Azərbaycan Müəllimlər İnstitutunun Salyan, Mingəçevir və Sumqayıt filialları ləğv olunub.

• Azərbaycan Respublikası Prezidentinin 30 sentyabr 2014-cü il tarixli sərəncamları ilə 60 nəfər təhsil işçisi "Əməkdar müəllim", 4 nəfər "Əməkdar bədən tərbiyəsi və idman xadimi" fəxri adları, 60 nəfər isə "Tərəqqi" medalı ilə təltif olunub.

• Azərbaycan Respublikası Prezidentinin 8 oktyabr 2014-cü il və 21 iyul 2015-ci il tarixli sərəncamları ilə 4 nəfər gənc istedad xüsusi aylıq təqaüdə layiq görülüb.

• Azərbaycan Respublikası Prezidentinin 17 dekabr 2014-cü il tarixli sərəncamları ilə 2013-2014-cü dərs ilində keçirilmiş "Ən yaxşı ümumtəhsil məktəbi" və "Ən yaxşı müəllim" müsabiqələrinin qalibləri olan 50 məktəb və 100 müəllim mükafatlandırılıb.

• Azərbaycan Respublikası Prezidentinin 22 dekabr 2014-cü il tarixli sərəncamı ilə Turizm İnstitutunun bazasında Azərbaycan Turizm və Menecment Universiteti yaradılıb.

• Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 16 yanvar 2015-ci il tarixli sərəncamı ilə dövlət ümumi təhsil müəssisələrində çalışan bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin həftəlik dərs yükü norması 1,5 dəfə, aylıq vəzifə maaşı orta hesabla 2 dəfə artırılıb.

• Azərbaycan Respublikası Prezidentinin 19 yanvar 2015-ci il tarixli sərəncamı ilə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı" təsdiq olunub.

• Azərbaycan Respublikası Prezidentinin 15 may 2015-ci il tarixli sərəncamı ilə İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin Bakı filialı yaradılıb.

• Azərbaycan Respublikası Prezidentinin 24 iyul 2015-ci il tarixli sərəncamı ilə Mingəçevir Politexnik İnstitutunun bazasında Mingəçevir Dövlət Universiteti yaradılıb.

• Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1 may 2015-ci il tarixli 125 nömrəli qərarı ilə "Azərbaycan Respublikası vətəndaşlarının xarici ölkələrdə, əcnəbilərin və vətəndaşlığı olmayan şəxslərin Azərbaycan Respublikasında təhsil alması Qaydaları" təsdiq edilib.

• Azərbaycan Respublikası Nazirlər Kabinetinin 21 iyul 2015-ci il tarixli qərarı ilə xaricdə təhsil alan gənclərin təhsil haqlarının verilməsi qaydalarında dəyişiklik edilib.

• Azərbaycan Respublikası Nazirlər Kabinetinin 17 avqust 2015-ci il tarixli qərarı ilə Azərbaycan Maliyyə-İqtisad Kolleci Azərbaycan Dövlət İqtisad Universitetinin, Bakı Texniki Kolleci və Bakı Dövlət Rabitə və Nəqliyyat Kolleci isə Azərbaycan Texniki Universitetinin nəzdinə verilib.

**"Azərbaycan müəllimi" qəzeti**
**12 sentyabr 2015-ci il**

# Təhsil xəbərləri

## 3185 azərbaycanli gənc dünyanın aparıcı ali təhsil müəssisələrində təhsil almaq imkanı qazanıb

2014-2015-ci tədris ilində azərbaycanlı gənclərə "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı" çərçivəsində dünyanın 33 ölkəsinin 544 ali təhsil müəssisəsində təhsil almaq məqsədilə müraciət etmək imkanı verilib. Müsahibələr nəticəsində 573 tələbənin adı dünyanın nüfuzlu ali məktəblərində təhsil almaq hüququ qazanmış proqram təqaüdçüləri siyahısına daxil edilib.

Dövlət Proqramı çərçivəsində indiyədək 3185 gənc dünyanın aparıcı ali təhsil müəssisələrində təhsil almaq imkanı qazanıb. Onlardan 1360 nəfəri son 2 il ərzində dünyanın nüfuzlu ali məktəblərinə göndərilib.

## 1636 nəfər tələbə SABAH qruplarında təhsil alır

Təhsil Nazirliyinin təşəbbüsü ilə ölkəmizdə ilk dəfə olaraq ali məktəblərdə təhsil alan xüsusi istedadı və təlim uğurları ilə fərqlənən tələbələrdən ibarət SABAH qruplarının yaradılması layihəsi reallaşdırılmağa başlayıb. Ötən tədris ilində 7 ali məktəbdə 34 ixtisas üzrə bu qruplarda 755 tələbə təhsil alıb. Ehtiyacı olan 200-ə yaxın tələbə yataqxana ilə təmin edilib. Yeni dərs ilində 7 baza ali təhsil müəssisəsinin sırasına daha 4-ü də daxil olub, ixtisas qruplarının sayı 5-dən 6-ya, kadr hazırlığı aparılan ixtisasların sayı isə 39-dan 45-ə çatdırılıb. Bu il SABAH qruplarına 881 tələbə yeni qəbul olunub. Beləliklə, bu qruplarda təhsil alan tələbələrin sayı 1636 nəfər olub.

Təhsil Nazirliyinin təşkilatçılığı ilə ilk dəfə 1-ci SABAH Forumu keçirilib.

## "Gələcəyin müəllimi təqaüdü" alanların sayı 600 nəfərə çatıb

Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbəyə şamil olunur. Ötən tədris ilində 300 tələbə bu təqaüdü alıb. Bu il isə ikinci dəfə 300 nəfər I kurs tələbəsinə "Gələcəyin müəllimi təqaüdü" verilib. Beləliklə, bu təqaüdü alanların sayı 600 nəfər olub.

## 2000 təhsil müəssisəsi yüksək sürətli internetlə təmin olunub

Təhsil Nazirliyi tərəfindən tədris müəssisələrinin Azərbaycan Təhsil Şəbəkəsinə qoşulması və avadanlıqlarla təchizatı üzrə işlər davam etdirilir.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planına uyğun olaraq, 2015-ci ilin avqust ayı ərzində Bakı, Sumqayıt, Gəncə şəhərlərini, Tovuz, Bərdə, İsmayıllı və Gədəbəy rayonlarını əhatə edən 41 təhsil müəssisəsi Azərbaycan Təhsil Şəbəkəsinə (ATŞ) qoşulub.

Bu günədək ATŞ-ə qoşulmuş 2000 təhsil müəssisəsi yüksək sürətli internetlə təmin olunub. Həmin təhsil müəssisələri bir-biri və Təhsil Nazirliyinin digər qurumları ilə keyfiyyətli kommunikasiya qurmaq imkanı qazanıblar.

Qeyd edək ki, ATŞ ölkədə tədris prosesini daha effektiv qurmağa zəmin yaratmaqla yanaşı, məsafədən asılı olmayaraq, təhsildə müsbət təcrübənin ötürülməsini də təmin edir. Artıq ucqar yaşayış məntəqələrindəki məktəblərin müəllim və şagirdləri də ATŞ vasitəsilə elektron resurslardan istifadə edərək biliklərini artıra bilirlər. Eyni zamanda, ATŞ-də istifadə edilən "Websens" proqramının internet filtr sistemi vasitəsilə məktəblilər üçün zərərli hesab edilən vebsaytlara giriş məhdudlaşdırılıb.

Eyni zamanda təhsil müəssisələrinin İKT avadanlıqları ilə təmin olunması məqsədilə əlavə olaraq, ölkə üzrə 1200 ədəd Monoblok Lenovo stolüstü kompüteri paylanılıb. Həmin kompüterlər informasiya-kommunikasiya texnologiyaları sahəsində savadlılığın artırılması üzrə keçirilən təlimlərin qiymətləndirilməsində yüksək nəticə göstərmiş pedaqoji və inzibati idarəetmə heyətinin üzvlərinə verilib.

## 50 məktəbdə hərbi kabinetlər yaradılıb

Təhsil Nazirliyi tərəfindən pilot layihə çərçivəsində 50 ümumtəhsil məktəbində müasir standartlara cavab verən hərbi kabinetlər yaradılıb.

Hərbi kabinetlərdə lectr lectron təlim avadanlıqları quraşdırılıb. Eyni zamanda kabinetlər təlim üçün nəzərdə tutulmuş müasir avtomatlar, tapançalar, qumbaralar və minalar ilə təchiz olunub.

Təlim üçün nəzərdə tutulan avadanlıqlar həqiqi silahlardan yalnız atəş konstruksiyası ilə fərqlənir. Bu silahlar həm kütləsi, həm də atəş zamanı təpməsi baxımından həqiqi silahla eyni olması ilə yanaşı, tam təhlükəsizdir. Elektron təlim avadanlıqları xüsusi mexanizm və proqram təminatına malikdir.

Qeyd edək ki, paytaxtla yanaşı, ölkəmizin digər bölgələrində də ümumtəhsil məktəblərinin müasir hərbi kabinetlərlə təchiz olunması planlaşdırılır. Şəmkir və Kürdəmirdə tikilmiş yeni məktəblərdə belə kabinetlər artıq quraşdırılıb.

## Əsab Astan oğlu Quliyev

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. Nəcib və xeyirxah insan, təcrübəli təhsil işçisi, istedadlı və tanınmış pedaqoq-alim, Riyaziyyat və informatika fakültəsinin Riyaziyyat və onun tədrisi metodikası kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru, Əməkdar müəllim Əsab Astan oğlu Quliyev bu il iyun ayının 23-də 83 yaşında vəfat etmişdir.

Əsab Quliyev 1932-ci il may ayının 1-də Qərbi Azərbaycanın Zəngəzur qəzasının Sisyan rayonunun Qızılcıq kəndində anadan olmuşdur. 1941-ci ildə Qızılcıq kənd 7 illik məktəbin 1-ci sinfinə daxil olmuş, 1952-ci ildə Vağadi kənd orta məktəbini fərqlənmə ilə bitirmişdir. O, elə həmin il Azərbaycan Dövlət Pedaqoji İnstitutunun(indiki ADPU) Fizika-riyaziyyat fakültəsinə daxil olmuş, 1956-ci ildə həmin fakültəni bitirmişdir. 1956-cı ildən 1960-cı ilə qədər Sisyan rayonunun Dəstəgird qəsəbə orta məktəbində fizika-riyaziyyat müəllimi işləmişdir.

Ə.Quliyev 1960-cı ildə "Riyaziyyatın tədrisi metodikası" ixtisası üzrə ADPİ-nin aspiranturasına qəbul olmuş, 1963-cü ildə aspiranturanı bitirmişdir. 1967-ci ildə uğurla "Riyaziyyat tədrisinin şagirdlərin istehsalat fəaliyyəti ilə əlaqələnməsi(neft sənayesinin materialları üzrə)" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir. O, 1963-1967-ci illərdə Riyaziyyat və onun tədrisi metodikası kafedrasında müəllim, 1967-1970-ci illərdə baş müəllim, 1970-ci ildən isə dosent vəzifəsində çalışmışdır. 1970-1975-ci illərdə Riyaziyyat fakültəsində dekan müavini vəzifəsində işləmişdir.

Dosent Ə.Quliyev işlədiyi müddətdə daim elmi yaradıcılıqla məşğul olmuşdur. Onun 120-dən çox elmi-metodik əsəri, o cümlədən məqalələri, dərs vəsaitləri və monoqrafiyası vardır. Bunlara "Riyaziyyatın tədrisində ümumiləşdirmələr", "Cəbr və analizin başlanğıcı", "Cəbrin məsələ vasitəsilə yekun təkrarı", "Planimetriyanın təkrarla öyrənilməsi" və digər əsərlərini nümunə göstərmək olar. O, daim kütləvi informasiya vasitələri ilə, xüsusilə də, "Gənc müəllim" qəzeti ilə fəal əməkdaşlıq etmiş və bu qəzetdə müntəzəm olaraq təhsil sahəsi üçün aktual olan metodik məqalələr çap etdirmişdir. Onun eyni zamanda çoxlu sayda məqalələri qəzet və jurnallarda dərc edilmişdir.



Dosent Ə.Quliyev riyaziyyat elmi ilə maraqlanan gənclərin təhsil almalarında da mühüm rol oynamış, tələbələrin böyük hörmətini qazanmışdır. Əsab müəllimin yetirmələri arasında bu gun həm respublikamızda, həm də xarici ölkələrdə mühüm elmi uğurlar qazanmış onlarla şəxs var ki, onlar da öz müəllimlərinin yolunu layiqincə davam etdirirlər.

Dosent Ə.Quliyevin səmərəli elmi-pedaqoji fəaliyyəti ölkə rəhbərliyi tərəfindən layiqincə qiymətləndirilmişdir. Tanınmış metodist-alim Ə.Quliyev ölkəmizdə təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 dekabr 2006-cı il tarixli Sərəncamına əsasən "Azərbaycan Respublikasının Əməkdar müəllimi" fəxri adına layiq görülmüşdür. Dosent Ə.Quliyev həmçinin uğurlu elmi-pedaqoji fəaliyyətinə görə dəfələrlə Təhsil Nazirliyinin, ADPU-nun fəxri fərmanları ilə təltif olunmuşdur.

Səmimi və xeyirxah insan, tanınmış pedaqoq-alim, ləyaqətli ailə başçısı olan Əsab Quliyevin əziz xatirəsi onu tanıyanların qəlbində daim yaşayacaqdır.

***Allah rəhmət eləsin!***

**ADPU-nun kollektivi**

# Bizim sevimli müəllimimiz

***Müəllimlik peşələr arasında ən şərəfli, ən müqəddəs peşələrdən biri, bəlkə də, birincisdir. Bu peşəni bizə bu qədər sevdirən də elə bizim müəllimlərimizdir. Ulu öndər Heydər Əliyevin sözləri ilə desək, "Müəllim peşəsi ona görə şərəflidir ki, o, cəmiyyət üçün ən dəyərli, ən bilikli, zəkalı və tərbiyəli vətənpərvər vətəndaşlar yetişdirir". Bu dəyərli ifadəni bizim sevimli müəllimimiz, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji fakültəsinin Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının dosenti Bəyməmməd Saday oğlu Cəbrayılov haqqında işlətmək yerinə düşər. Mənim həyatımda, bir tələbə-gənc kimi formalaşmağımda bir çox müəllimlərin əməyi, zəhməti var. Bakıdakı 286 nömrəli tam orta məktəbdə, Pedaqoji Kollecdə mənə dərs deyən müəllimlərimi həmişə hörmətlə xatırlayıram.***



Artıq üç ildir ki, ADPU-nun Pedaqoji fakültəsinin "İbtidai sinif müəllimliyi" ixtisasında təhsil alıram. Bizə yüksək elmi-pedaqoji hazırlığa malik olan professor-müəllimlər dərs deyirlər. Onların arasında dosent Bəyməmməd Cəbrayılovun xüsusi yeri var. Çünki o, bizə çətinlik çəkdiyimiz riyaziyyat fənnini sevdirməyə nail olub. Səmimi etiraf edim ki, "Riyaziyyat bütün elmlərin şahıdır" kəlamını çox eşitsək də, bu fikrə o qədər də diqqət yetirməmişik. Lakin Bəyməmməd müəllimin mühazirə və seminar məşğələlərini dinlədikdən sonra bir daha yəqin etdim ki, aqillər necə də haqlıdır: doğrudan da, riyaziyyat bütün elmlərin açarıdır. Bəyməmməd müəllimi biz tələbə-gənclərə sevdirən əsas xüsusiyyəti tədris etdiyi fənni dərindən bilməsi, tələbələrlə işləməkdən zövq alması, ciddi və tələbkar olması ilə yanaşı, humanist xarakterə malik olmasıdır. Bəyməmməd müəllim incə qəlb sahibidir, obyektivdir, yaxşı oxuyan, nizam-intizamlı tələbə onun sevimlisidir. O, riyazi məsələləri elə səbirlə, həvəslə şərh edir ki, elə bil mənsur şeir söyləyir. Ağ təbaşir qara lövhədə izlər açdıqca çöhrəsinə təbəssüm qonur. Dərslərində yeni təlim texnologiyalarından, fəal təlim metodlarından səmərəli istifadə edir. 90 dəqiqəlik dərsin necə gəlib keçdiyini heç kim hiss etmir. Dərsdə problem situasiya yaradır, hər kəsin öz fikrini söyləməsinə imkan verir.

Seminar dərslərimiz də çox maraqlı keçir. Bəyməmməd müəllim seminarlarda hər bir tələbə üçün ayrıca xüsusi kartoçkalar hazırlayır, kartoçkalardakı sualları cavablandırdıqdan sonra həyəcan içində ballarımızın açıqlanmasını gözləyirik. Yaxud da riyazi diskussiyalar keçiririk ki, bunlar da bizdə növbəti məşğələyə həvəs yaradır.

Hazırda Pedaqoji fakültənin tələbələri dosent B.Cəbrayılovun "Riyaziyyatın ibtidai kursunun nəzəri əsasları" kitabından istifadə edirlər. Kitabdakı bütün mövzular ətraflı, aydın və isbatlarla, misallarla verilmişdir. Kitab tələbələrdə riyazi bilikləri formalaşdırmaq baxımından mühüm əhəmiyyət kəsb edir. Eyni zamanda Bəyməmməd müəllimin yalnız bu kitabı deyil, digər dərslik və dərs vəsaitləri ,elmi məqalələri də bizim üçün dəyərlidir.

Qeyd edək ki, dosent B.Cəbrayılovun ömrünün 60 illik zirvəsindən dönüb geriyə baxanda fəxr etməyə, sevinməyə mənəvi haqqı var. Çünki Bəyməmməd müəllim bu illəri olduqca mənalı,səmərəli, şərəfli yaşamışdır. Gözəl ailə, sevimli iş, onlarla dərslik və dərs vəsaiti, elmi məqalələr və bizim kimi yetişdirdiyi minlərlə tələbələr onun 60 illik ömrünün naxışı, bəzəyidir. Biz də sevimli müəllimimizi bu əlamətdar yubleyi münasibətilə ürəkdən təbrik edir, ona möhkəm cansağlığı, uzun ömür, elmi-pedaqoji fəaliyyətində yeni-yeni uğurlar arzulayırıq!

**Günəş Şükürova,**
**Pedaqoji fakültənin**
**III kurs tələbəsi**

## Fikrət Rəştiyev-75

# Şərəfli və müqəddəs peşə sahibi

İstedadlı və tanınmış pedaqoq-alim, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizikanın tədrisi metodikası kafedrasının dosenti Fikrət Mövsüm oğlu Rəştiyev 1940-cı ildə Bakı şəhərində anadan olmuşdur. 1948-1958-ci illərdə Yasamal rayonundakı 199 nömrəli məktəbdə orta təhsil almışdır. 1958-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) Fizika-riyaziyyat fakültəsinə daxil olmuşdur. O, 1963-cü ildə ali məktəbi bitirdikdən sonra Şabran rayonu (keçmiş Dəvəçi rayonu) Gilgilçay kənd orta məktəbində fizika müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1963-cü ilin noyabr ayından 1965-ci ilin sentyabr ayına kimi Sovet Ordusu sıralarında xidmət etmişdir.

Fikrət Rəştiyev universitetdə təhsil alarkən həm də idmanla məşqul olmuş, 5 il voleybol komandasının kapitanı olmuşdur. Həmin vaxtlar Azərbaycanın bir çox rayonlarında və bəzi respublikalarda, o cümlədən Moldovada institutların komandaları arasında yoldaşlıq görüşünü keçirmişdir. O, institutda oxuyarkən həm də 12 nömrəli musiqi məktəbinin tar şöbəsini bitirmiş, ADPU-nun "Müəllim" ansamblının üzvü olmuşdur.

F.Rəştiyev 1965-ci ilin sentyabr ayında ali təhsil aldığı ADPU-nun Fizikanın tədrisi metodikası kafedrasına baş laborant təyin edilmişdir. O, 1967-ci ildə müsabiqə yolu ilə müəllim, 1968-ci ildə isə baş müəllim vəzifəsinə seçilmişdir.

Fikrət müəllim pedaqoji fəaliyyətə başlayarkən elmi yaradıcılığa da böyük həvəs göstərmişdir. O, həmin dövrdə çox aktual olan televiziyadan tədris prosesində istifadə edilməsinə çalışmış, tədris televiziyasının praktik problemlərinin üzərində işləmişdir. Tədris televiziyasının imkanlarını və şagirdlərə təsir xüsusiyyətlərini göstərmək üçün 1971-1976-cı illərdə televiziya ilə orta məktəb şagirdləri üçün fizika dərsləri aparmışdır. Öz tədqiqatlarının materiallarını və nəticələrini orta məktəblərdə kütləvi şəkildə tətbiq etmək, pedaqoji ictimaiyyəti maarifləndirmək məqsədilə həmin dövrdə Fikrət müəllim 3 tədris vəsaiti nəşr etdirmişdir. Bu uğurlu fəaliyyətin məntiqi yekunu olaraq o, 1973 -cü ildə "Televiziya-orta məktəbdə fizikanın tədrisində təlim vasitəsi kimi" mövzusunda namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərək pedaqoji elmlər namizədi (indi pedaqoji elmlər üzrə fəlsəfə doktoru) alimlik dərəcəsi almış və 1975-ci ildə dosent vəzifəsinə seçilmişdir. Fikrət müəllimə ötən əsrin 60-80-ci illərində professor A.Abbaszadə, dosentlər B.Şəfizadə, B.Sultanov, T.Xasməmmədov, Ə.Əhmədov, Ə.Axundov, Z.Osmanov və digər görkəmli metodist alimlərdən dərs almaq və onların bir çoxu ilə çiyin-çiyinə işləmək xoşbəxtliyi nəsib olmuşdur. Onların zəngin təcrübəsindən bəhrələndiyini dəfələrlə qeyd edən Fikrət müəllim bu gün özü gənc müəllimlərə layiqli örnəkdir. Tükənməz enerjiyə malik olan və pedaqoji fəallığı ilə seçilən Fikrət müəllimi institut rəhbərliyi 1972 -ci ildə Fizika fakültəsinə dekan müavini vəzifəsinə təyin etmişdir. Sonralar o, Fizikanın tədrisi metodikası kafedrasının müdiri və dekan vəzifəsini müəyyən müddət icra etmişdir.

Fikrət müəllim Fizikanın tədrisi metodikası kafedrasının "Fizikadan məktəb eksperimenti" laboratoriyasının təkmilləşdirilməsində bu gün də öz yardımını əsirgəmir. Buna Fikrət müəllimin son dövrlərdə laboratoriya işlərinin aparılmasına dair yazdığı "Məktəb fizika eksperimentinin texnologiyası" adlı metodik vəsaiti misal göstərmək olar.

Azərbaycanda fizikanın tədrisi metodikası elminin inkişaf tarixi ilə bağlı ciddi və sistemli tədqiqat aparan Fikrət müəllimin tapıntıları və ümumiləşdirilmələrinə aid respublika , ümumittifaq, beynəlxalq və universitet elmi konfranslarında etdiyi məruzələr, nəşr etdiyi məqalələr pedaqoji ictimaiyyət tərəfindən maraqla qarşılanmışdır.



Dosent F.Rəştiyev 1989-1994-cü illərdə fizikanın tədrisi metodikası ixtisası üzrə ixtisaslaşmış Müdafiə Şurasının üzvü olmuşdur. Müdafiə Şurasının üzvü kimi o, həmişə gənc mütəxəssislərin elmi -metodik səviyyələrinin yüksəlməsinə çalışmış və bir neçə namizədlik dissertasiyasının müdafiəsində opponentlik etmişdir.

Fikrət müəllim vaxtilə "Bilik" Cəmiyyətinin xətti ilə müxtəlif müəssisələrdə aktual mövzularda mühazirələr oxumuş və həmin mühazirələr həmişə maraqla dinlənilmişdir. Təsadüfi deyildir ki, o, "Bilik" Cəmiyyətinin birinci dərəcəli fəxri fərmanı ilə təltif olunmuş, səmərəli elmi-pedaqoji fəaliyyətinə görə dəfələrlə rektorluğun, həmçinin Təhsil Nazirliyinin təşəkkür və fəxri fərmanlarına layiq görülmüşdür.

Təcrübəli təhsil işçisi olan Fikrət müəllim Bakı şəhərinin bir sıra orta məktəblərinin fizika müəllimləri ilə daim əlaqə saxlayır. Bu görüşlər zamanı fizika fənninin tədrisi vəziyyətini, məktəb fizika eksperimentinin təşkili, əyaniliyin müxtəlif formalarından istifadə və s. məsələləri öyrənir və onlara lazımi məsləhətlər verir. İlin demək olar ki, 4 ayını Bakının 13 saylı məktəbində gələcək müəllimlərlə pedaqoji təcrübə aparır. Pedaqoji təcrübə zamanı kurikulumla əlaqədar müəllimlərə müxtəlif göstərişlər, məsləhətlər verir. Fikrət müəllim ADPU-nun tarixində 50 il ərzində eyni məktəbdə pedaqoji təcrübədə iştirak edir.

Fikrət müəllimin fəaliyyətində gənclərlə işləmək, onlara qayğı göstərmək xüsusi yer tutmuşdur. Hər il onun 2-3 tələbəsi Tələbə Elmi Cəmiyyətinin (TEC) xətti ilə səmərəli fəaliyyət göstərərək maraqlı məruzələr hazırlayır və tələbə elmi konfranslarında müvəffəqiyyətlə çıxış edirlər. O, bakalavr və magistirlərin diplom və dissertasiya işlərinə bacarıqla rəhbərlik edir, müxtəlif proqlamların müəllifidir.

Fikrət müəllim fəal ictimaiyyətçi olmuşdur. O, müxtəlif illərdə fakültə həmkarlar təşkilatının sədri, partiya təşkilat bürosunun katibi, qrup rəhbəri və s. vəzifələrdə çalışmışdır. 10 il müddətində fakültə pedaqoji təcrübəsinin rəhbəri olmuşdur.

Pedaqoji elmlər üzrə fəlsəfə doktoru, dosent F.Rəştiyev həm də gözəl ailə başçısıdır. İki övlad böyüdüb, tərbiyə etmişdir, hər ikisi ali təhsillidir. Nəvələri vardır.

Yaradıcılığı ilə həyatı vəhdət təşkil edən F.Rəştiyev yüksək mənəvi keyfiyyətlərə malik bir müəllimdir. O, ciddi, nizam-intizamlı, tələbələrinə qarşı tələbkar, eyni zamanda obyektiv olmaqla yanaşı, həm də səmimi və qayğıkeşdir. Fizikanın tədrisi metodikası kafedrasında Fikrət müəllimin özünəməxsus yeri və mövqeyi vardır.

Sentyabrın 24-də nəcib, xeyirxah insan, istedadlı və təcrübəli metodist-alim F.Rəştiyevin 75 yaşı tamam oldu. Şərəfli və müqəddəs peşə sahibi olan Fikrət müəllim hazırda ömrün müdrik çağını yaşayır. Biz də bu əlamətdar yubleyi münasibətilə Fikrət müəllimi ürəkdən təbrik edir, ona cansağlığı, uzun ömür və elmi-pedaqoji fəaliyyətində yeni uğurlar arzulayırıq.

**Xəlil PADAROV,**
**Fizika fakütəsinin dekan müavini, dosent**

# Yeni dərs ili dünya ölkələrində nə vaxt başlayır?

***Dünyanın bir sıra ölkələrində yeni dərs ili ənənəyə uyğun olaraq sentyabrın 1-də başlayır. 1 sentyabr həm də «Bilik Günü»kimi qeyd olunur. "Bilik Günü"nün dünyanın ayrı-ayrı ölkələrində fərqli vaxtda və fərqli qaydada keçirilməsi ənənəsi də vardır. Beləliklə də dünya ölkələrində yeni dərs ili nə vaxt başlayır?***



**RUSİYA.** Rusiyada bir çox məktəblərdə məşğələlər ilk payız günündə başlayırdı. 1492-ci ildən başlayaraq ölkədə Bizans təqvimi tətbiq olunurdu, ona müvafiq olaraq yeni il 1 sentyabrdan başlanırdı. 1699-cu ildə I Pyotr "Yeni ilin qeyd olunmasına dair" 1735 nömrəli sərəncam imzalayıb. 10 gün sonra isə ölkə 1700-cü ili 1 yanvardan bayram edib. Dərs ilinin başlanması vaxtı isə tədris prosesini pozmamaq və uzunmüddətli yay tətillərini qış mövsümünə keçirməmək üçün əvvəlki tarixdə qalıb. Bu məsələdə kilsə də öz sözünü deyib. Məktəblərin bir çoxu kilsələrin nəzdində olub, ona görə də din xadimləri dərs ilinin dəyişdirilməsinə tələsməyiblər. İnqilabdan əvvəlki Rusiyada dərs ilinin vahid başlanma tarixi olmayıb, təhsil müəssisələrində məşğələlər müxtəlif vaxtlarda başlayıb. Kənd yerlərində dərslər təsərrüfat işlərinin başa çatmasından sonra payızın axırlarında, şəhərlərdə isə avqustun ortalarında başlayıb. 1935-ci ildə bütün məktəblərdə dərslərin eyni gündə - sentyabrın 1-dən başlanması barədə qərar verilib. 1980-ci ildə isə SSRİ Ali Soveti Rəyasət Heyətinin fərmanı ilə "Bilik günü" təsis olunub. Sovet İttifaqının süqutundan sonra «Bilik Günü»sentyabrın 1-də bir sıra postsovet ölkələrində (Rusiya, Belarus, Ukrayna, Moldova, Qazaxıstan, Türkmənistan) rəsmi bayram kimi qeyd olunub.



Avropa ölkələrinin əksəriyyətində - Fransa, İrlandiya, Belçika, Polşa, Çexiya, Estoniya, Litva, Macarıtan, Sloveniyada dərs ili 1 sentyabrda və ya sentyabrın ilk bazar ertəsi günü başlayır. Slovakiyada yeni dərs ili bir gün sonra, sentyabrın 2-də başlayır, çünki sentyabrın 1-də ölkədə milli bayram - Konstitusiya günü qeyd olunur. Birləşmiş Krallıqda yeni dərs ili sentyabrın ilk həftəsində başlayır və bir qayda olaraq uyulun ortalarında başa çatır. İstisna hal kimi yalnız Şotlandiyada dərslər avqustun ortalarından start götürür. Böyük Britaniyada tədris ili 3 rübdən ibarətdir. Rüblər arasında bir həftəlik qısamüddətli tətillər nəzərdə tutulur. Məktəbə 4-5 yaşında gedir, 15-16 yaşında başa vururlar. Bütün məktəblərdə dərs günü səhər saat 9-da başlayır, 15-də başa çatır. Günün ikinci yarısında uşaqlar öz vaxtlarını idmana, dərnəklərdəki müxtəlif məşğələlərə həsr edə bilərlər.

Avstriya, Vyana və Aşağı Avstriyada yeni tədris ili sentyabrın ilk bazar ertəsi, digər əyalətlərdə bir həftə sonra başlayır. Ölkədə belə bir ənənə var: ilk dərs günü həm şagirdlər, həm də valideynlər məktəbə milli paltarda gəlirlər. Balacalar 6 yaşda məktəbə gedirlər.

**FİNLANDİYA.** Yeni dərs ili avqustun 15-də başlayır. Bu ölkədə oxumaq hər bir uşağın arzusu hesab olunur. Şagirdlərə böyük azadlıqlar verilir. Gündəliklər yoxdur, valideynlər ayda bir dəfə uşaqların təhsil uğurlarına dair bildiriş vərəqi alırlar. Məşğələlərdə tədrislə yanaşı sevdiyin işlə məşğul ola bilərsən. Əgər uşaq öyrədici filmə baxmaq istəmirsə, ona kitab oxumağa icazə verilir. Əsas məsələ başqalarına mane olmamaqdır. Fin məktəblərində əsas məqsəd uşaqları oxumağa məcbur etmək deyil, yeni biliklər qazanmağa motivasiya yaratmaqdadır. Müəllimlər öz gələcəklərini müəyyən etməkdə şagirdə kömək edir,

(Davamı 8-ci səhifədə)

# Elmi-tədqiqat işlərinin səviyyəsi yüksəlir

***Hər bir ölkənin, dövlətin gələcək inkişafı onun təhsil sahəsinin inkişafından asılıdır. "Təhsil millətin gələcəyidir!" deyən ulu öndər Heydər Əliyevin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev elm və təhsilə böyük qayğı və diqqət göstərir. Hazırda milli təhsil sistemimiz ayrı-ayrı sahələrdə deyil, bütövlükdə kompleks şəkildə inkişaf edir. Bu baxımdan, ölkəmizdə ali pedaqoji təhsilin öncülü hesab edilən Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) də son illər əhəmiyyətli işlər görülməkdədir.***




ADPU-nun professor-müəllim heyəti və tələbə kollektivi təhsil sahəsində işlərin yenidən qurulmasının vacibliyini dərk edir və bu istiqamətdə konkret addımlar atır. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun və universitetin tanınmış alimlərinin Elmi Şuranın iclaslarındakı çıxışları işlərin yenidən qurulmasından xəbər verir.

ADPU-nun professor-müəllim heyəti öz vəzifəsini layiqincə dərk edir və konkret işlər görür. Bu mənada son illərdə Pedaqoji Universitetin rektorluğu və professor-müəllim heyəti əhəmiyyətli işlər görmüş, nəzərdə tutulmuş işləri uğurla həyata keçirmişdir. Belə ki, Azərbaycan Respublikası Prezidentinin «2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı»nın təsdiq edilməsi barədə 22 may 2009-cu il tarixli, 295 saylı Sərəncamından irəli gələn vəzifələrin icrası məqsədilə ADPU-da elmi-tədqiqat işlərinin istiqamət, problem və mövzularına yenidən baxılmış, nəzəri və praktik əhəmiyyətli aktual problemlər ön plana çəkilmişdir.

Qeyd edək ki, ADPU-da 11 fakültə, 52 ixtisas kafedrası, magistratura və doktorantura şöbəsi fəaliyyət göstərir. Universitetin 708 nəfərdən ibarət professor-müəllim heyəti təsdiq edilmiş mövzu planı əsasında 71 istiqamətdə, 78 problem üzrə 449 mövzuda elmi-tədqiqat işlərini davam etdirir. Yerinə yetirilən işlər nəticəsində tətbiqi və innovasiya xarakterli ən əhəmiyyətli 52 iş tədris prosesinə tətbiq edilmişdir.

ADPU-da 85-ə yaxın tədris və 7 elmi-tədqiqat laboratoriyası (ETL) fəaliyyət göstərir. 7 ETL-də ("Yeni bioloji aktiv birləşmələr" "Koordinasion birləşmələr" "Nadir torpaq elementləri", "Dədə Qorqud", "Pedaqoji təhsilin problemləri", "Bioinformatika") aparılan elmi-tədqiqat işlər fundamental və tətbiqi tədqiqatlara istiqamətlənmişdir.

Universitetin əməkdaşları tərəfindən 2014-2015-ci tədris ilində 287-i xarici ölkə mətbuatında (28-i impakt faktorlu jurnalda) olmaqla 880 elmi məqalə, 246 tezis (xaricdə - 107), 76 dərs vəsaiti, 37 dərslik, 30 monoqrafiya, 342 metodik vəsait nəşr olunmuş, 1 patent və 2 şəhadətnamə alınmışdır.

Son bir ildə beynəlxalq və respublika elmi konfranslarında müəllimlərin fəallığı artmış, 5 nəfər elmlər doktoru, 9 nəfər fəlsəfə doktoru dissertasiyası müdafiə etmiş, 2 nəfər professor və 5 nəfər dosent diplomuna layiq görülmüşdür. Əməkdaşların elmi fəallığının artmasında son illər keçirilən «İlin alimi» müsabiqələrinin də stimullaşdırıcı rolu olmuşdur. Bununla yanaşı, universitetin professor-müəllim heyəti 3 beynəlxalq və 6 respublika elmi konfranslarında iştirak etmişdir,

ADPU-da elmi fəaliyyətin koordinasiya edilməsi, səmərəliliyinin artırılması, xarici və ölkədaxili qrant layihələrində iştirakının gücləndirilməsi məqsədilə universitetdə «Elm və innovasiyalar» şöbəsi yaradılmışdır. Şöbə ADPU-da elmi-tədqiqat işlərinin planlaşdırılmasını, yerinə yetirilməsini və nəticələrinin istehsalatda və tədris prosesində tətbiq olunması haqqında hesabatların tərtib olunmasını, elmi və elmi-pedaqoji kadrların attestasiyasını, müzakirədən keçirilməsini, müasir elmi-innovativ metodların tədqiqat prosesində və təhsil sistemində tətbiqini təşkil edən struktur bölmədir.

Bu günə kimi şöbə əməkdaşlarının iştirakı ilə aşağıdakı işlər görülmüş və görülməkdədir:

1. ADPU-nun tərəfdaş olduğu "ENOTES - Azərbaycanda ECDL Milli Operator və Test Mərkəzləri" TEMPUS layihəsi çərçivəsində İsveçin Stokholm şəhərində yerləşən Kral Texnologiya İnstitutunda, Latviyanın Riqa şəhərində yerləşən İnformasiya Sistemləri İdarəetmə İnstitutunda və İspaniyanın Alikante şəhərində yerləşən Alikante Universitetində ADPU-nu Avropaya layiqincə tanıtdırmışdır.

2. British Council təşkilatı tərəfindən Böyük Britaniyanın 18 universiteti ilə görüşdə ADPU-nu təmsil edərək universitetlərarası əlaqələri müzakirə etmiş, Bakı Elm Festivalının təşkilatçılarından biri olmuş, ADPU-da Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondu rəhbərliyinin və əməkdaşlarının görüşünü təşkil etmiş, Avropa İttifaqının Erasmus Mundus proqramı çərçivəsində ADA Universitetində Azərbaycan universitetləri ilə müxtəlif layihələrdə qrant layihələrini qazanmaq üçün tədbirdə iştirak etmişdir.

3. ADPU ilə Qafqaz Universiteti arasında əməkdaşlıq protokolu imzalanmışdır, Pakistanın COMSATS İnformasiya Texnologiyaları İnstitutu ilə əməkdaşlıq protokolunun imzalanması son mərhələdədir.

4. Patent almaq üçün Üzvi kimya və kimya texnologiyası kafedrasının 4 əməkdaşının sənədləri Standartlaşdırma, Metrologiya və Patent üzrə Dövlət Komitəsinə göndərilmiş, Elektrik və optika kafedrasının 3 əməkdaşının isə sənədləri patent almaq üçün həmin komitəyə göndərilmək üçün hazırlanır.

5. Təsərrüfat hesablı müqavilələri imzalamaq üçün Müdafiə Sənayesi Nazirliyinin strukturları ilə müzakirələr aparılır.

Təhsil Nazirliyinin, Dünya Bankı ekspertlərinin "Təhsil sistemində islahatlar" layihəsi çərçivəsində birgə işləyib hazırladıqları "Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsilin və müəllim hazırlığının konsepsiya və strategiyası"nın 2008-ci ildən başlayaraq reallaşması ilk növbədə pedaqoji kadr hazırlığında innovativ təhsil modellərinin sistemli şəkildə tətbiqi ilə bağlıdır. ADPU-nun Kompüter Mərkəzində bu mühüm fəaliyyət istiqamətinin elmi-metodoloji təminatı üzrə bir sıra konkret işlər görülməkdədir. Kompüter Mərkəzində həmçinin universitetin professor-müəllim heyətinin, İKT yönümlü tədrisin layihələndirilməsi və reallaşdırılması üzrə ixitisas artırılması yönümündə kompleks tədbirlər planı işlənib hazırlanaraq həyata keçirilir.

"Təhsildə İKT" elmi-metodik jurnalının nəşrində ölkənin pedaqoji elm və təhsil sahəsinin qabaqcıl elm xadimləri, pedaqoqlar, Türkiyə Respublikasının, Avropanın, MDB ölkələrinin alim və mütəxəssisləri fəal iştirak edirlər.

ADPU-da elektron test texnologiyalarının tətbiqinin nəticələri, test imtahanlarının keçirilməsinin pedaqoji, psixoloji, tərbiyəvi aspektləri tədqiq olunmuşdur.

Qısa bir müddət ərzində universitetin müxtəlif ixtisaslar üzrə bakalavr və magistr pilləsində təhsil alan tələbələri, həmçinin «İnformatika» ixtisası üzrə təhsil alan magistrantlar «İntel. Gələcək üçün təhsil» proqramı üzrə keçirilən kurslarda, intensiv təlim prosesi gedişində, İKT-nin tədris sahəsində tətbiqinə dair sistemli biliklərə müvəffəqiyyətlə yiyələnmişlər.

Tədris metodikası kafedralarının professor-müəllim heyətinin, tədrisin İKT təminatı yönümündə zəruri biliklərə, peşə ixtisasının məzmununa yiyələnməsi, tədris informasiya materiallarının işlənib hazırlanması məqsədilə Kompüter Mərkəzinin elm və təhsilin informatlaşması şöbəsi tərəfindən mütəmadı olaraq işçi seminarlar keçirilir.

Eyni zamanda ADPU tərəfindən Yaponiyanın Qifu Dövlət Universitetinə təhsilin innovativ inkişafını əks etdirən müqavilə məktubu göndərilmişdir.

Dil biliklərinin inkişaf etdirilməsi məqsədi ilə Fransa səfirliyinin və ADPU-nun Beynəlxalq əlaqələr şöbəsinin təşəbbüsü ilə Fransa mütəxəssislərinin universitetimizin tələbələrinə dərs deməyə cəlb olunmaları istiqamətində işlər aparılır.

Hazırda ADPU-nun elm və təhsil sahəsində gələcək beynəlxalq əlaqələri çərçivəsində Estoniya, Çexiya, Pakistan, Yunanıstan, Qırğızıstan, Monteneqro, Serbiya və Polşa universitetləri ilə elmi əməkdaşlıq müqavilələri bağlamaq üçün layihələşdirilmə işləri aparılır.

Son bir ildə ADPU-da Azərbaycan Respublikasının Prezidenti Yanında Elmin İnkişafı Fondundan ümumi məbləği 18,8 min manat olan 3 qrant layihəsi hesabına maliyyələşən elmi-tədqiqat işləri yerinə yetirilmişdir:

Ölkəmizin milli təhsil sistemi keyfiyyət və kəmiyyət baxımından gündəngünə yüksəlişə doğru inkişaf edir. Bu yüksəliş ADPU-da aydın görünür. Belə ki, hazırda universitetin doktoranturasında 25 ixtisas üzrə təhsil aparılır, Universitetdə təhsil alan doktorant və dissertantların ümumi sayı:

- doktorantlar: fəlsəfə doktoru proqramı üzrə - 68 nəfər.
- dissertantlar: fəlsəfə doktoru proqramı üzrə - 56 nəfər; elmlər doktoru proqramı üzrə - 37 nəfər.

2014-cü ildə doktoranturaya fəlsəfə dokroru proqramı üzrə 70 nəfər (10 nəfəri xarici vətəndaş), dissertanturaya elmlər doktoru proqramı üzrə 38 nəfər, fəlsəfə doktoru proqramı üzrə 57 nəfər qəbul olunmuşdur.

Hazırda ADPU-da fəlsəfə doktoru proqramı üzrə 120 nəfər doktoranturada təhsilini davam etdirir (10-u xarici vətəndaş). Doktorant - 64, dissertant - 56 nəfərdir.

. Son illər universitetimizdə bütün sahələrdə olduğu kimi, Tələbə Elmi Cəmiyyətinin (TEC) də işi çox canlanmışdır. Hazırda ADPU-da 10 fakültədə TEC fəaliyyət göstərir. Yaxşı haldır ki, indi universitet TEC-nin konfransına qədər bütün fakültələr ayrı-ayrılıqda fakültə TEC-nin konfransını keçirirlər. Gələcəkdə uyğun fakültələrin (tarix, filologiya, coğrafiya, biologiya, kimya, fizika, riyaziyyat, texniki fənlər, pedaqoji, psixologiya) birgə TEC-nin konfransının keçirilməsi planlaşdırılır. Eyni zamanda fakültələr daxilində və fakültələr arasında yarışların keçirilməsinin də təşkili planlaşdırılır. Hər bir fakültədə "yaxşı" və "əla" qiymətlərlə oxuyan tələbələr təcrübəli professor və dosentlərin rəhbərliyi altında elmi-tədqiqat işləri aparırlar. İldə bir dəfə bütün fakültələrdə universitet üzrə tələbələrin elmi konfransları keçirilir və onların elmi-tədqiqat işlərinin nəticələri ayrıca toplu şəkilində çap olunur. TEC-in xətti ilə elmi-tədqiqat işləri aparan tələbələrin ən yaxşı işləri ali məktəblərin gənc tədqiqatçılarının hər il keçirilən ənənəvi ümumrespublika konfransına təqdim edilir. ADPU-da hər il TEC-in xətti ilə 13 elmi konfrans keçirilir. 2014-2015-ci tədris ilində universitetin doktorant-dissertantlarının (102 məqalə, 66 tezis), magistrantlarının (386 məqalə, 179 tezis), bakalavrlarının (12 məqalə, 391 tezis) elmi əsərləri çap olunmuşdur. Bütün bunlar göstərir ki, universitetimizin tələbələri biliklərə dərindən yiyələnmiş və onu praktikada uğurla tətbiq etməyi bacarmışlar.

Xüsusi qeyd etmək istəyirəm ki, ADPU-nun rektoru, professor Yusif Məmmədov gənclərimizə bu sahədə həmişə xüsusi qayğı və diqqət göstərir, onların elmə təşviq edilməsi və istedadlı gənclərin elmi-tədqiqat işlərinin qiymətləndirilməsi üçün lazımi əməli tədbirləri həyata keçirir, onları mükafatlandırır. Bu da öz növbəsində gənclərin elmi fəaliyyətinə stimul verir.



**Almarə ABBASOVA,**
**«Elm və innovasiyalar» şöbəsinin mütəxəssisi**

# Yeni dərs ili dünya ölkələrində nə vaxt başlayır?

(Əvvəli 6-cı səhifədə)

onun qabiliyyət və istedadını üzə çıxarır. Finlandiyanın təhsil qanununa görə, dərs ili 188 gün davam edir və mayın 31-də başa çatır.

**İSPANİYA.** İlk dərs günü bütün ölkə üzrə fərqlidir, müxtəlif əyalətlərdə ayrı-ayrı vaxtlara təsadüf edir. Ümumiyyətlə, qanuna əsasən, bütün şagirdlər təhsilə oktyabrın 1-dən gec olmayaraq başlamalıdır. Qarmaqarışıqlıq müxtəlif vaxtlarda yekunlaşa bilən məhsul yığımı ilə bağlıdır. Tədris ili üç rübdən ibarətdir və iyunun ortalarında başa çatır. Şagirdlərin bilikləri 1-10 balla qiymətləndirilir. İspaniyalı şagirdlərin gündəlikləri yoxdur. Ev tapşırıqlarına və lövhə qarşısında verilən cavablara görə də qiymətlər yazılmır. İspaniya məktəbliləri yay tətilində (iyunun 20 -dən), Pasxa bayramı şərəfinə bir həftə, Milad bayramında isə iki həftə ərzində istirahət edirlər.



**ALMANİYA.** Ölkənin 16 federal torpaqlarının hər birinin yeni dərs ilinin başlanması ilə bağlı öz qaydaları mövcuddur. Bir qayda olaraq, uşaqlar məktəbə avqustun ortalarında və ya sentyabrın əvvəllərində göndərilir. İlk tədris ilində birinci sinfə gələn almaniyalı şagirdlər məktəbə "Birincinin torbası" ilə gəlirlər ki, valideynlər bu torbaya uşaqları üçün hədiyyə qoyurlar. Orada şirniyyat, dəftərxana ləvazimatı, kitab ola bilər. XIX əsrdə bu ənənə yenicə yarananda torbaya, məsələn, çəkmə də qoya bilərdilər. Yeri gəlmişkən, torbanı uşaqlar kağızdan yapışdıraraq özləri hazırlayırlar, valideynlər isə hədiyyə ilə doldururlar. Almanlar uşaqlarının məktəb həyatına hazırlığına çox ciddi münasibət bəsləyirlər. Uşaqların təkcə bilikləri deyil, həm də psixoloji hazırlığı yoxlanılır. Məsələn, uşaq 1 saat ərzində oturmağı, 20 dəqiqə ərzində bütün diqqətini hansısa əşya üzərində cəmləşdirməyi bacarmalıdır.

Yay tətili altı həftə davam edir, il ərzində məktəblilər Milad, Pasxa bayramlarında istirahət edirlər.

**AMERİKA BİRLƏŞMİŞ ŞTATLARI.** ABŞ-da dərs ilinin başlanmasına dair dəqiq tarix yoxdur. Yeni dərs ili avqustun istənilən bir günü və ya sentyabr ayının ilk günlərində başlaya bilər. Bu məsələ müstəqil surətdə hər ştat səviyyəsində həll olunur. Tədris ili iyunun sonunda başa çatır. Uşaqlar yaşadıqları ştatın təhsil haqqında qanununa uyğun olaraq məktəbə müxtəlif yaşda - 5-8 yaşında gedirlər. Tədris ili üç rübə bölünüb, onların arasında uşaqlar üçün kiçik tətil günləri var, yay tətili isə iyunun sonunda başlayır.

**KANADA.** Dərslər sentyabrın ilk çərşənbə axşamından sonra dövlət bayramı olan və yayın bitməsini simvolizə edən "Əmək günü"ndən sonra başlayır. Kanadada valideynlər uşaqları üçün tədris proqramını özləri seçə, zəruri hesab etdikləri hallarda isə müəllimləri evlərinə dəvət edə bilərlər. Qiymətləndirmə faizlərlə aparılır. Məsələn, 50-60 faiz "qaneedici", 65-75 faiz "yaxşı", 80-90 faiz "əla" deməkdir.

MEKSİKA. Ölkədə dərslər avqustun sonuncudan əvvəlki bazar ertəsi başlayır.

**YAPONİYA.** Yaponiyalı şagirdlər üçün məktəbin qapıları aprelin 1-də açılır. Məhz həmin gün ölkə əhalisi üçün gənclik, gözəllik və yeni həyatın başlanması rəmzi olan sakura çiçəkləməyə başlayır. Əla əhvali-ruhiyyə və çiçəkləyən ağacların gözəlliyi yaponiyalı məktəblilərin səmərəli təhsil yolunda ən yaxşı müşayiətçisi olur. Uşaqlar 6 yaşından məktəbə gedir, tədris ili isə üç rübdən ibarətdir və növbəti il martın 31-də başa çatır. Uşaqları qışda və yazda kiçik, yayda isə bir aylıq tətil gözləyir. Bəzi yapon analar öz uşaqlarının təhsilinə çox diqqətlə yanaşır. Onlar müəllimlərlə sıx əlaqə saxlayır, məktəbin həyatında fəal iştirak edir, bəzi hallarda, xüsusən də uşaqları xəstələnəndə onlarla birlikdə məktəbə gedə və dərsi dinləyə bilərlər.

Yaponiya təhsil sisteminin özəlliyi bundadır ki, məktəbdə bütün tədris ili ərzində siniflərin tərkibi dəyişir. Beləliklə də öz sinif yoldaşları ilə dil tapa bilməyən şagird rahat şəkildə digər sinfə keçə və yeni dostlar qazana bilər.

**HİNDİSTAN.** Yeni dərs ili yazda, aprel ayında başlayır. Uşaqlar artıq 3 yaşlarından "playschool" adlandırılan təhsil müəssisələrinə gedirlər, onlar burada gün ərzində 2-3 saat oynayır, hərfləri öyrənməyə çalışırlar. 4 yaşından isə I sinfə gedirlər. Məktəblərin çoxunda tədris ingilis dilindədir. Buna görə də ölkə əhalisinin əksəriyyəti ingilis dilini yaxşı bilir. Uşaqlar həm dövlət, həm də özəl məktəblərə gedirlər.





Hindistan məktəblərində yalnız kişilər dərs deyir. Riyaziyyat ən şərəfli fənn sayılır. Hər bir məktəbin öz xüsusi məktəbli forması var, uşağa baxdıqda onun hansı məktəbdə oxuduğu dərhal bəlli olur. Böyük tətillər Hindistanda ən isti aylarda - may və iyunda başlayır. Məşğələlər iyulun əvvəlində, istilər bir qədər səngiyəndə bərpa olunur.

**ÇİN.** Dərs ili sentyabrın 1-də başlayır və bir qədər gec - iyulun əvvəllərində başa çatır. Məktəbdən əvvəl balacalar - 3-6 yaşdan uşaq bağçalarına gedirlər. İbtidai məktəblərin tədris proqramı kifayət qədər mürəkkəbdir, siyasət, mənəvi tərbiyə, Çin dili, coğrafiya, kimya, biologiya, fizika, musiqi və incəsənət kimi fənləri mənimsəmək balacalar üçün heç də asan deyil.

**CƏNUBİ KOREYA.** Dərs ili daha tez, martın 2-də başlayır, yay tətili iyulun ortalarından avqustun sonlarına kimi davam edir.

Tropik zonada yerləşən Malayziya və Sinqapurda məktəbin qapıları şagirdlər üçün yanvarın ilk bazar ertəsi və ya yanvarın 3-də açılır. Tailandda dərs ili mayın ortalarında, Filippində isə iyunun ilk həftəsində başlayır. Honkonq və Tayvanda dərs ili avqustun sonunda, Kambocada oktyabrın ilk bazar ertəsi başlayır. Braziliyada yeni dərs ilinin başlanması fevralın birinci həftəsinə, şimal tropik zonasında yerləşən əyalətlərdə isə sentyabr ayına təsadüf edir. Yeni Zelandiyada ilk dərslər fevralın ilk çərşənbə axşamı başlayır. Avstraliyada isə şagirdlər ştatlardan asılı olaraq yayın istisindən çəkinməyərək yanvarın sonu və fevralın əvvəllərində məktəbə qayıdırlar.

Cənubi Afrika Respublikası. CAR-da isə dərslər təxminən yanvarın ortalarından start götürür. Uşaqlar çox erkən - 4 yaşdan məktəbə gedirlər. Məktəb həyatına hazırlıq isə 3 yaşdan başlayır, balacalar oyun formasında hərflər və ətraf mühitin əşyalarını öyrənirlər. Məktəbə qəbul olunmaq üçün uşaqlar xüsusi imtahan verməlidirlər.

* * *

Fransa, İrlandiya, Belçika, Polşa, Çexiya, Estoniya, Litva, Macarıstan, Sloveniya, Birləşmiş Krallıq, Şotlandiya, Böyük Britaniyada məktəbə 4-5 yaşında gedir, 15-16 yaşında başa vururlar.

Avstriyada ilk dərs günü həm şagirdlər, həm də valideynlər məktəbə milli paltarda gəlirlər.

Finlandiyada şagirdlərə böyük azadlıqlar verilir. Gündəliklər yoxdur, valideynlər ayda bir dəfə uşaqlarının təhsil uğurlarına dair bildiriş vərəqi alırlar.

Almanlar uşaqlarının məktəb həyatına hazırlığına çox ciddi münasibət bəsləyirlər. Uşaqların təkcə bilikləri deyil, həm də psixoloji hazırlığı yoxlanılır. Məsələn, uşaq 1 saat ərzində oturmağı, 20 dəqiqə ərzində bütün diqqətini hansısa əşya üzərində cəmləşdirməyi bacarmalıdır.

ABŞ-da dərs ilinin başlanmasına dair dəqiq tarix yoxdur. Yeni dərs ili avqustun istənilən bir günü və ya sentyabr ayının ilk günlərində başlaya bilər.

Kanadada valideynlər uşaqları üçün tədris proqramını özləri seçə zəruri hesab etdikləri hallarda isə müəllimləri evlərinə dəvət edə bilərlər.

Hindistan məktəblərində yalnız kişilər dərs deyir. Riyaziyyat ən şərəfli fənn sayılır. Hər bir məktəbin öz xüsusi məktəbli forması var, uşağa baxdıqda onun hansı məktəbdə oxuduğu dərhal bəlli olur.

**Oruc MUSTAFAYEV,**
**"Azərbaycan müəllimi" qəzeti**

*12 sentyabr 2015-ci il*

**Xarici mətbuatın materialları əsasında**

## Müəllim

Nə qədər ucadır müəllim adı,
Zülmətdə parlayan işığa bənzər.
Ona yaraşıqdır elmi, savadı,
Şöhrəti, hörməti dünyanı gəzər.

Həkimin, hakimin, cümlə alimin
Sənəti yolunda müəllim dayanır.
İşıqlı həyatın, sonsuz aləmin
Sabahı, keçmişi nura boyanır.

Bu elə sənətdir, naşını sevməz
Cəfakeş olana minnətdar olar.
Təsadüf gələn də bir gün görünməz,
Bu da onun üçün böyük ar olar.

Yoxmu başqa bir ad hörmət naminə?
Hər kəsi müəllim adlandırmayaq!
Ehtiram göstərib, şöhrət naminə,
Onun saf adını bulandırmayaq!

**Rəşad MAHMUDOĞLU,**
**Filologiya fakültəsinin qiyabi şöbəsinin V tədris ilinin 501-ci qrup tələbəsi, AYB-nin üzvü**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Hesablama riyaziyyatı və informatika kafedrasının dosenti

**Şavər Talıbovanın**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Botanika kafedrasının baş müəllimi Ofelya Tağıyevaya qardaşı

**Aqil Məmmədovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının baş müəllimi Ofelya Sadıqzadəyə qardaşı

**Ramiz Məmmədovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri Vurğun Məmmədova anası

**Havva Məmmədovanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Funksiyalar nəzəriyyəsi kafedrasının müəllimi Süreyya Nəcəfovaya nənəsi

**Gülsayat xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elmi kitabxananın böyük kitabxanaçısı Gülər Ağarzayevaya qardaşı

**Türkel Nağıyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi psixologiya kafedrasının əməkdaşı Zəhra Aslanovaya atası

**Məmmədağa Hacıyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Mətbəənin əməkdaşı Elmira İsmayılovaya həyat yoldaşı

**Adil İsmayılovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.


Redaktor əvəzi: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 3138
Sayı: 1500
Çapa imzalanıb: 30.09.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.